# AŞIQ ƏLƏSGƏR – 190

# DƏDƏ ƏLƏSGƏRİN SAZ BAYRAMI, SÖZ BAYRAMI

***Dekabrın 14-də Heydər Əliyev Sarayında Mədəniyyət və Turizm Nazirliyinin və Azərbaycan Aşıqlar Birliyinin təşkilatçılığı ilə Azərbaycan aşıq poeziyasının görkəmli nümayəndəsi, haqq aşığı Aşıq Ələsgərin anadan olmasının 190 illiyinə həsr olunmuş yubiley gecəsi keçirildi.***

Tədbiri Mədəniyyət və Turizm naziri Əbülfəs Qarayev açaraq Aşıq Ələsgərin 190 illik yubileyinə Türkiyə, İran, Gürcüstan və Dağıstandan



(Rusiya) təşrif buyurmuş aşıqları və bütün təbdir iştirakçılarını salamladı. Azərbaycan aşıq sənətinin təbliği və inkişafına dövlətin diqqət və qayğısından danışan nazir bu sahədə Heydər Əliyev Fondunun prezidenti, UNESCO və İSESCO-nun xoşməramlı səfiri Mehriban xanım Əliyevanın müstəsna rolu olduğunu vurğuladı. Qeyd olundu ki, 2009-cu ildə Azərbaycan aşıq sənətinin UNESCO-nun Qeyri-maddi mədəni irs siyahısına daxil edilməsi xalqımızın bu ölməz sənətinin haqlı olaraq dünya mədəniyyət inciləri sırasında özünə layiq yer tutduğunu göstərir: “Milli-mənəvi dəyərlərin təbliğində və inkişafında müstəsna xidmətləri olmuş xalqımızın ümummilli lideri Heydər Əliyevin təşəbbüsü ilə Aşıq Ələsgərin 150 və 175 illik yubileyləri dövlət səviyyəsində qeyd edilmişdir. Bu sahəyə həmişə dövlət qayğısı olmuş, aşıqlarımız, bu sahədə çalışan digər ifaçılar fəxri adlara layiq görülmüş, onların konsertləri üçün şərait

yaradılmışdır. 2010-cu ildə Azərbaycan qeyri-maddi mədəni irsinin, xüsusilə Azərbaycan aşıq sənətinin dünyada tanıdılmasına mühüm töhfə verən I Beynəlxalq Aşıq Festivalının keçirilməsi də bu sənətə göstərilən daimi diqqətin bariz nümunəsidir".



Nazir çıxışında ulu ozan Dədə Qorqudun xeyir-duası ilə əsrlərdən bəri yol gələn aşıq sənətinin azman ustadlarından Aşıq Qurbaninin, Tufarqanlı Abbasın, Sarı Aşığın, Xəstə Qasımın, Aşıq Alının zəngin sənət nümunələri ilə aşıq ədəbiyyatının zənginləşdiyini qeyd etdi, 190 illik yubileyi qeyd olunan Aşıq Ələsgəri Azərbaycan aşıq sənətinin zirvələrindən biri kimi dəyərləndirdi: "Azərbaycan aşıq şeirinin ən böyük nümayəndələrindən hesab olunan Aşıq Ələsgər aşıq yaradıcılığının bütün



sahələrinə müraciət etməklə ədəbiyyatımızda dərin iz buraxmışdır. O, qeyri-adi fitri qabiliyyəti sayəsində yaratdığı müxtəlif səpkili, rəngarəng məzmunlu sənət inciləri ilə zirvəyə yüksəlmişdir".



Qeyd olundu ki, ustad sənətkarın yaradıcılığı haqqında elmi-tədqiqat işləri yazılmış, aşığın şeirlərinə mahnılar bəstələnmiş, rəssamlar tərəfindən portretləri işlənmişdir. Aşıq Ələsgər yaradıcılığının vurğunu olan Hüseyn Həsənov öz şəxsi mənzilində ustadın muzeyini yaratmışdır.

Yubiley gecəsində Xalq artisti Afaq Məlikovanın rəhbərlik etdiyi Azərbaycan Dövlət Rəqs ansamblı, Silahlı Qüvvələrin Mahnı və Rəqs ansamblı, Əməkdar mədəniyyət işçisi, Prezident təqaüdçüsü Aşıq İsfəndiyar Rüstəmovun rəhbərlik etdiyi Gədəbəy aşıqlar ansamblı,



Ağstafa, Qazax və Tovuz aşıqları, Aşıq Əhliman Kəlbəcərlinin rəhbərlik etdiyi Kəlbəcər aşıqları, “Aşıq Pəri” məclisinin üzvləri Gülarə Azaflı, Telli Borçalı və Zülfiyyə İbadova, Borçalı aşıqları Ramin Qarayev və Əşrəf Təmirov, eləcə də Cahangir Quliyev və Avdı Musayev də rəngarəng çıxışları ilə yadda qaldılar. Dədə Ələsgərin yubiley gecəsinə Cənubi Azərbaycandan təşrif buyurmuş aşıq Səlcuq Şahbazinin rəhbərlik etdiyi “Dədə Qorqud” aşıqlar ansamblının, Təbriz və Qaradağ aşıqları Aşıq Məhbub Xəlili, Çingiz Biriya, Abbas Məhəmmədi, Zakir Rabi, Məhəmməd və Əli Nəbati qardaşlarının möhtəşəm çıxışları alqışlarla qarşılandı. Anadoludan Bakıyacan yol gələn Aşıq Fuad Çərkəzoğlu və Aşıq Qul Nurinin Aşıq Ələsgəri bədahətən vəsf etmələri gecəyə xüsusi rəng qatdı. Dərbənddən



Dədə Ələsgər gecəsinə gələn Aşıq Osman bəy Məhəmməd İbrahimin çıxışı da alqışlarla qarşılandı.

Aşıq Mahmud Məmmədovun "Baş divanisi", Fəzail Miskinlinin "Baş Sarıtel"i, Aşıq Mais Gəncəlinin "Təcnis"i, Ədalət Dəlidağlı, Azər Xanlaroğlu, Roman Azaflı və İlqar Qələmçəlinin birlikdə ifa etdikləri "Ruhani", Əməkdar mədəniyyət işçisi Nemət Qasımlı və şagirdlərinin çıxışı, Dəmir Vəliyev, Qələndər Zeynalov, Altay Məmmədli, Azər Alıyev və Fazil Məmmədovun birgə ifa etdikləri "Misri", Aşıq Ulduz və İlham Astanbəylinin ifasında "Naxçıvangülü" üstündə Aşıq Ələsgərin sözləri dil açıb danışdı.



Aşıq Fətulla Əliyevin rəhbərlik etdiyi Göyçə aşıqlar qrupunun, Aşıq Ağamurad Şirvanlının rəhbərliyi ilə Şirvan aşıqlarının, Solmaz Kosayeva və "Aşıq Pəri" məclisinin üzvlərinin çıxışları da maraqla qarşılandı.

Gecədə Cavanşir Quliyevin Aşıq Ələsgərin sözlərinə yazdığı "Xoş gəldin" mahnısı, Xalq artisti Gülyaz Məmmədovanın ifasında, "Sudan gələn sürməli qız" mahnısı isə Xalq artisti Teymur Mustafayevin ifasında səsləndi.

Xatırladaq ki, yubiley gecəsinin ssenari müəllifi və rejissoru Əməkdar incəsənət xadimi Abdulla Qurbani idi.

**Təranə VAHİD**



**ELÇİN**
**Xalq yazıçısı**

# TƏŞRİF BUYUR, GEDƏK BAĞA...

*(Aşıq Ələsgərin Sözü və Sazı haqqında bir neçə söz)*

Neçə gündür ki, Aşıq Ələsgərin həmişəki kimi iddiasız, sadə, təmiz bir misrası, elə bil ki, kitabların səhifəsində yox, qədim (və doğma!) Göyçə mahalında qoca Ələsgərin sazı sinəsinə sıxıb söylədiyi gəraylıdan – həmin o məqamdan qopub gəlmiş o bir misra elə hey fikrimdə dolaşır: "Təşrif buyur, gedək bağa..."

Həmin iddiasız bir misra bu dəm mənim üçün Sözün və Sazın sirri-sehri (və heç vaxt açılmayacaq, əbədi bir sirr-sehr) ilə dolu idi, çünki o bağ təkcə təbiətin xudmani, gözəl bir guşəsi deyildi, o bağ Ələsgər dünyası idi:

*Təşrif buyur, gedək bağa,*
*At zülfünü sola, sağa.*
*Ələsgər sənə sadağa,*
*Üzün məndən niyə döndü?*

Aşıq Ələsgər 105 il ömür sürdü.

1821-ci ildə Azərbaycan Sözünün, Sazının beşiklərindən biri olan qədim oğuz yurdunda – gözəl Göyçə mahalında ("Adım Ələsgərdi, əslim göyçəli...") anadan olub, 1926-cı ildə elə orada da haqq dünyasına köçdü və bu iki tarix arasında həmin Sözün və Sazın yaratdığı Ələsgər dünyasında o qədər hiss-həyəcan var, bu hiss-həyəcan o qədər qəribə, adamı mat qoyan və adamın ürəyini içinə dolan gücə, incəliyə, işığa

malikdir, o qədər saya-hesaba gəlməyən rənglərdən ibarətdir ki, həmin Ələsgər dünyasının, hətta o uzun ömrün çərçivələrinə sığması da haqdan gələn verginin nəticəsidir.

Ələsgər Sözü və Sazı ilə Qarabağdan, Gəncədən tutmuş Tiflisəcən el-obanı dolaşdı, Türkiyə mahallarını gəzdi, məclislər apardı, toylar keçirdi və Sözlə Sazın dediklərini xalqın özünüifadəsinə çevirdi, əvvəlki dövrlərin korifeyləri Yunus Əmrə, Qaracaoğlan, Qurbani, Abbas Tufarqanlı, Xəstə Qasım... kimi aşıq sənətini ən yüksək bədii-estetik meyarlarla bir daha təsdiq etdi.

Bütün böyük sənətkarlar kimi, Aşıq Ələsgərin yaradıcılığı da milli hadisədir, milli mədəniyyətin faktıdır. Ancaq böyük sənətkarların yaradıcılığı bunu da sübut edib ki, bəşəriyə aparan yol öz başlanğıcını millidən götürür və bu mənada Ələsgərin yaradıcılığı da klassik bir nümunədir: o nə qədər millidirsə, bir o qədər də bəşəridir.

Hələ XIX əsrin ortalarında, cavan yaşlarında ikən Aşıq Ələsgər məşhur rus şairi Yakov Palonski ilə görüşür və bu görüşdən (aşıq yaradıcılığından!) təsirlənən Palonski xüsusi məqalə yazır.

Yakov Palonski hara, Aşıq Ələsgər hara?

Tamam müxtəlif mühit, müxtəlif psixologiya, müxtəlif təfəkkür tərzi, müxtəlif dünyagörüşü...

Məsələ həmin milli ilə bəşərinin birliyində, vəhdətindədir. Buna görə də, o görüşdən 100 il keçdikdən sonra, başqa bir məşhur rus şairi – Konstantin Simonov da yəqin eləcə təsirləndiyi üçün Aşıq Ələsgərin altı qoşmasını və şair Vəli ilə deyişməsini rus dilinə gözəl tərcümə etmişdir. Allah vergisi, əlbəttə, millidi, amma o veriləndən sonra nə coğrafi, nə də milli sərhədlər tanıyır.

Aşıq sənəti Azərbaycan folklorunun əsasını təşkil edir və misal üçün, island saqalarından, yaxud rusların "İqor polkunun dastanı"ndan fərqli olaraq, Azərbaycan dastanlarını və ümumiyyətlə, bütün Türk dastanlarını yalnız Söz yox, Sözlə bir yerdə həm də Saz yaratmışdır, qədim "Kitabi-Dədə Qorqud"dan tutmuş "Əsli və Kərəm"əcən, "Koroğlu"dan tutmuş Aşıq Ələsgərin özü haqqında yaranmış "Aşıq Ələsgərin Şınıq səfəri", yaxud "Aşıq Ələsgər qarabağlıların yaylağında" kimi Azərbaycan dastanlarının mayası aşıq sənəti ilə yoğrulmuşdur.

Aşıq sənəti əslində bir fərdin yaratdığı teatrdır.

Aşıq – şairdir. Aşıq – yazıçıdır (dastanlar yaradır). Aşıq – dramaturqdur (deyişmələr, dramatik dialoqlar). Aşıq – bəstəkardır ("Dilqəmi"dən tutmuş "Ruhani"yəcən, "Kərəmi"dən tutmuş "Keşişoğlu"nacan yüzlərlə havacatı kim yaradıb? Naməlum aşıq!). Aşıq – müğənnidir. Aşıq –

bugünkü ifadə ilə desək, bədii qiraət ustasıdır. Aşıq – instrumental ifaçıdır.

Bütün bunların hamısı da bir nəfər, bir fərddir.



Uzun-uzun əsrlər boyu aşıq sənəti, misal üçün, yaponların "Kabuki", ya "No" teatrları, yaxud ispanların romanserosu kimi milli bədii təfəkkürün (indiki halda Azərbaycan milli bədii təfəkkürünün) faktına çevrilib.

Avropada fransız truveri və trubadurluğu, yaxud alman minnezingerliyi xalqı necə ifadə etmişdirsə, aşıq sənəti də Azərbaycanda həmin işi görmüşdür, amma fərq ondan ibarətdir ki, truverlik və trubadurluq da, minnezingerlik də ayrı-ayrı əvvəli və sonu məlum dövrlərin, mərhələlərin hadisəsidirsə, aşıq sənəti əvvəli Orxon-Yeniseydən xəbər verən, sonu isə olmayan bir sənətdir, daim qaynayır, daimi dinamikaya malikdir, bütün dövrlərin müasir yaradıcılığıdır.

Və min il bundan əvvəl olduğu kimi, bu gün də belədir.

Və Aşıq Ələsgər həmin yaradıcılığın klassikidir.

Aşıq Ələsgər – filosofdur:

*Günahkardı, nə ki yoldan azan var,*
*İki mələk – xeyir-şəri yazan var.*
*Əsarət var, Qıl körpü var, qazan var,*
*Orda qəbul olsun niyazım mənim...*

Aşıq Ələsgər – estetdir:

*Axşam-sabah, çeşmə, sənin başına,*
*Bilirsənmi, necə canlar dolanır?!*
*Büllur buxaq, lalə yanaq, ay qabaq,*
*Şahmar zülfü pərişanlar dolanır...*

Yaxud:

*Çərşənbə günüdə, çeşmə başında,*
*Gözüm bir alagöz xanıma düşdü.*
*Atdı müjgan oxun, keçdi sinəmdən,*
*Cadü qəmzələri qanıma düşdü...*

Aşıq Ələsgər – bədbindir:

*Ov keçdi bərədən, ata bilməzsən,*
*Uçdu getdi əldən, tuta bilməzsən.*
*Yerisən, yüyürsən çata bilməzsən,*
*Görürsən ki, baxtın yatdı, sən də yat...*

Yaxud:

*Nə bəlaya düşdüm mən bəxtiqara,*
*Eşqin ataşına heç olmaz çara.*
*Qalmışam zindanda aciz, avara,*
*Günahkar, sərgərdan, xəcalət eylə...*

Aşıq Ələsgər – nikbindir:

*Ruhun təzələnsin görəndə gərək,*
*Sən onun könlündə, o səndə gərək.*
*Haqqa şükür qılsın hər bəndə gərək,*
*Kim nə deyir bu dövrana, gözəldi...*

Aşıq Ələsgər – humanistdir, metafizikdir, moralistdir, maarifçidir, ilahiyyatçıdır, materialistdir, idealistdir, romantikdir, realistdir və s., və i.a.

Bəli, bütün bunlar belədir, amma mənim üçün Aşıq Ələsgər ilk növbədə Aşiqdir ("Ələsgərəm, gözəllərdi əzbərim...", yaxud: "Canım gözəllərin yol qurbanıdı...") və Ələsgər poeziyasının yaratdığı (və eyni zamanda həmin poeziyanı yaradan!) o Aşiq, olsun ki, ya zövqünə görə,

ya yaşına, ya da gözlərinin rənginə görə Məcnundan fərqlidir, Romeodan seçilir, Kərəmin eyni deyil, amma o da Leylinin, Cüllettanın, Əslinin sevgi dünyasında ən doğmalardan, ən məhrəmlərdən biridir, həmin sevgi, həmin sevda dünyasının sakinidir.

Bu sözləri yazıram və fikirləşirəm: mən nə üçün bunları yazıram?

Onsuz da Aşıq Ələsgərin Sözü və Sazı nə lazımdırsa, hamısını özü deyir.





**Zəlimxan YAQUB**
**Xalq şairi**

# YARALI XATİRƏ

1983-cü ilin yaz fəsliydi. "Bir ay yarım növbahardan keçəndə" dağları gəzmək həvəsinə düşmüşdüm. Ulu ozanımız Dədə Ələsgərlə bağlı "Göyçədən gələn səslər" adlı poema üzərində işləyirdim. O vaxta qədər bir neçə dəfə Göyçədə olmağıma baxmayaraq yenidən bu qədim sazlı-sözlü mahalın ziyarətinə can atırdım. Elə bil ki, qan yerinə damarlarımda bu ləngərli misralar dolaşırdı: "Adım Ələsgərdi, Göyçə mahalım". Bu qoşa, bir-birinə yaraşan müqəddəs adlar gözəgörünməz bir qüvvə ilə məni özünə çəkir, tarixi bir ünvana çağırırdı:

*Şeh düşdü göy çəmənə,*
*Göz vurdu göy çəmənə.*
*Ələsgəri səslədim,*
*Səs verdi Göyçə mənə.*

Bu misralar ürəyimdə o zaman baş qaldırmışdı. Bir gün tale fürsət verdi, qanadlandım o səsin gəldiyi tərəfə. Kəlbəcərdən Qazuçan yoluyla aşdım Göyçəyə. Heyrətdən doğan məhəbbət, məhəbbətdən doğan heyrət bir-birinə qarışmışdı. Cığırları, çəhlimləri, yolları, izləri bir-birinə qata-qata yeriyirdim. Uçurdum ulu səsin, ulu sözün, ulu sazın dərgahına doğru. Heyrətlənmişdim. Bu qədim torpağımızda Ələsgərin ayağıyla yeriyir, qarlı zirvələrə onun gözləriylə baxır, gülə-çiçəyə, daşa-qayaya onun əlləriylə toxunurdum. Göyçə təbiəti də öz növbəsində Aşıq Ələsgərə dönüb məni doğma övladı kimi bağrına basırdı. Söhbətimiz yaman tut-

muşdu. Ələsgər ocağında ustadın nəvəsi, hörmətli alimimiz İslam Ələsgərin evində unudulmaz görüşlər, məclislər bir-birini əvəz edirdi. Aşıq Ələsgərin sonbeşik oğlu aşıq Talıb rəhmətə getmişdi. Səsinə, sazına, söhbətlərinə maqnitafon lentində qulaq asırdıq. ”Ustad oğlu şəyird olmaz”, – deyiblər. Aşıq Talıbın söhbətləri Ələsgərin sirli-sehrli yaradıcılığına ayna tutur, düyünlü nöqtələri açır, gizli mətləbləri aşkarlayır, dəfələrlə eşitdiyimiz şeirlərin hamısında yeni məna çaları ilə qanımıza axır, varlığımıza hopurdu. Aşıq Talıbın söhbətlərinə ustadın nəvələri – şair qardaşımız İsmixan, Haqverdi Talıboğlu, İslam müəllim, Ələsgər ocağının sədaqətli dostu Həbib müəllim yeri gəldikcə öz əlavələrini, naxışlarını vurur, məclisimizi yaddaşlara yazırlar.

Gecələrin birində Ələsgər ocağının xeyir-duasını almaq, fikirlərini bilmək, məsləhətlərini eşitmək üçün “Göyçədən gələn səslər” poemasını oxudum. Hamı bir ağızdan ürəklə xeyir-dua verdi, mənə unudulmaz sevinc bəxş elədi. Bu tarixi günü xatirəyə çevirmək üçün məsləhət oldu ki, Ələsgərin məzarı başında şəkil çəkdirək. Nə yaxşı o şəkil çəkildi. Nə yaxşı o günləri yaşaya bildik.

Birdən-birə hər şey tərsinə döndü. Elə bil o günlər yalan imiş. Bir də gözlərimi açanda gördüm Göyçə dağılıb. Məni Göyçəyə çağıran bayatını tale yenidən tərsinə yazdırdı:

*Şeh düşdü göy çəmənə,*
*Göz vurdu göy çəmənə.*
*Ələsgəri çağırram,*
*Səs vermir Göyçə mənə!*

İstər-istəməz Aşıq Talıbın bir şeirini xatırladım:

*Dilimin əzbəri, andım, amanım,*
*Daha sağlığına yoxdu gümanım.*
*Ölüb Ələsgərim, itib İmanım,*
*Dolanıram, heç bir yanı tapmıram.*

İtgin düşən İmanın dərdindən göyüm-göyüm göynəyən Aşıq Talıb bir mahalın itgisini görsəydi, görəsən nə hala düşərdi. Taleyin işinə bax! Göyçədə Ələsgəri ziyarət eləmək Bağdadda Füzulini, Hələbdə Nəsimini ziyarət eləməkdən qat-qat çətin oldu. Bütün ağrı-acılarımıza baxmayaraq inanıram ki, bir gün bizi o yerlərə yenə Ələsgərin ruhu qaytaracaq!

*Könlümdə yaşadıb könül varını,*
*Sazımı eşqinlə çalmışam, ustad!*

*Aylarla oxuyub qoşmalarını,*
*İllərlə xəyala dalmışam, ustad!*

*Bağlanıb varlığım qıfılbəndinə,*
*Tilsimdi, sehrindən qopa bilmirəm.*
*Bağlama demisən, bircə bəndinə,*
*Bir ömür qoymuşam, aça bilmirəm.*

*Ürəyin yanğısı tellərə düşüb,*
*Cinas ilmələnib, təcnis toxunub.*
*Yazıya düşməmiş dillərə düşüb,*
*Ellərin dilində əzbər oxunub.*

*Sən elə qatmısan balı qaymağa,*
*Dadan ləzzətindən doymur, ay ustad!*
*Sözün şöhrətini elə, oymağa,*
*Hamı sənin kimi yaymır, ay ustad!*

*Baxdım yaratdığın misraya, bəndə,*
*Nə memar işidir, nə zərgər dedim.*
*Dilim söz tutanda, ağlım kəsəndə*
*Ələsgər çağırdım, Ələsgər dedim!*

1991-ci il.



**Məhərrəm QASIMLI**
**professor**



# EL YERİDİ, YALQIZ QALDIN SƏHRADA…

*(Dədə Ələsgərin ruhuyla söhbət)*

Gəlimli-gedimli, ölümlü-itimli bu gidi dünyaya göz açmağından yüz doxsan il keçir, Dədə Ələsgər!

Yüz doxsan il əvvəl göz açdığın ulu Göyçə torpağı oğuz ərənlərinin yurduydu…

Doxsan il əvvəl piran olub ağır-ağır dolandığın axar-baxarlı yaylaqlar bədöy atların ayaq səslərinə bel bağlayıb yaşıllana-yaşıllana süsənə-sünbülə bürünürdü…

Yaxınlara, lap yaxınlara qədər nurlu məzarına sərin mehiylə layla çalan göyçək gəlin bəzəkli Göyçə gölün ayna suları ruhumuzun dərmanıydı…

Dədə Ələsgər, neçə ki beləydi, sənin telli saz bağrında yuvalandırdığın:

*Bahar fəsli, yaz ayları gələndə*
*Süsənli, sünbüllü, laləli dağlar –*

misralarınla dağlarımızın könül tellləndirən tamaşasına dururduq. Bax onda, aydan arı, sudan duru könlümüzü sənin yaylağımız-torpağımız qədər şirin sözlərinə kökləyirdik:

*Gözəllər seyrəngahısan,*
*Görüm səni var ol, yaylaq!*
*Açılsın gülün, nərgizin,*
*Təzə mürguzar ol, yaylaq!*

Daha bu alyanaq sözlər dilimizə gələndə hərəmiz dolub-doluxsunmuş bir bayatı buluduna dönürük. Dönüb də gözümüz-könlümüz boyu Göyçə həsrətli isti yağışlar yağdırırıq.

…Neçə qərinədi ki, dünyanı dəyişibsən. Amma bizim bu ötəri, sərsəm dünyada bircə istəyin olub: ömrün qürubunda köç təbilini çalıb ana torpağına qovuşmaq! Hər birimizin beşikdən, bələkdən üzübəri bağrımız başında gizlin-gizlin, xəlvətcə əzizləyə-əzizləyə gəzdirdiyimiz bu müqəddəs umacağı sən ilahi bir qüdrətlə pıçıldamısan, Dədə Ələsgər:

*Öldür Aşıq Ələsgəri –*
*Özün günahkar ol, yaylaq.*

Bu gülqanad sözlərinin sirri-hikməti illərin, qərinələrin üstündən pərvazlana-pərvazlana yol gələndən sonra hələ indi-indi bizlərə əyan olur: yəni ki, a başına döndüyüm yaylaq, məni qərib-qürbətlərə düşməyə qoyma; öldür, sənə – vətənimə, ana torpağıma qarışım. Vətəndə ölmək səadətini ucalardan ucalara qaldıran bu mələk misralar niyə dilinə gəlib, ustad?! El-ulusunun başına gələcək sitəmli-zillətli qəhri-qəzanımı duymuşdun? Kim bilir… Duyuq düşməsəydin telli sazı qarabağır eləyib yanıqlı-yanıqlı sözləri pərişan durna qatarı nisbətində könlündən pərvazlandırmazdın ki…

*Köçər ellər, düşər səndən aralı,*
*Firqətindən gül nərgizin saralı.*
*Ələsgər Məcnun tək yardan yaralı,*
*Gəzər səndə dərdli, naləli, dağlar!*

Eldən-yardan aralı dayanıb duruş gətirməyə tabın-tavanın hardanıydı, Dədə Ələsgər?! Havalanıb məcnunmisal güzəran keçirmək də ovutmayacaqdı səni. O səbəbdən də ayrılıq xiffətinə dözməyəcəyini görüncə dəli könlün bir başqa hökmün fərmanını da verib:

*Arsız aşıq elsiz niyə yaşadı?*
*Ölsün Ələsgər tək qulların, dağlar!*

Eh, heç demə, sən bu fani dünyadan köçünü çəkib gedəndən sonra bizim başımıza gələn olacaqlardan xəbərdar imişsən. Murdar Qara Keşiş törəmələrinin ulu Göyçənin el-camaatını yurd-yuvadan perikdirəcəyi ürəyinə dammışdı. O vaxtlar üzünü Murovun, Murğuzun, dəli Qoşqarın qarlı-qubarlı gədiklərinə tutub xəyalında dolanan qara

qayğıları söz-söz, misra-misra çözələyirdin. Onda niyə eşitmirdik sənin səsini? Telli sazı bağrına basıb göyüm-göyüm göynəyə-göynəyə torpaqlarımızın qaymağı olan Göyçədən göz olmağı vəsiyyət eləyəndə sənin könlündən çox uzaqdaymışıq, ustad. O qədər uzaqdaymışıq ki, qara niyyətini saxta təbəssümündə gizlədən qarı düşməni dost bilirikmiş. Nə sənin bağrıqan misralarının harayını eşidirdik, nə də namərd Qara Keşiş törəmələrinin üzümüzə gülə-gülə, çörəyimizi yeyə-yeyə ayağımızın altını qazdığından xəbər tuturduq. Bu neçə müddətdə bizi aldanan görüb gorunda rahat yata bilməyibsən. İncik, nisgilli ruhun qubarlı sözlərə sığınıb. O, sözlər indi-indi gəlib bizlərə yetişir. Göyçəlilər Göyçəsiz qalandan sonra… Daha ulu Göyçədə bizim ellərdən bir nişana yoxdur. Yaylaqlarımız yad-yağıların it-qurd səsindən bezib-usanır; nərgiz-bənövşələrin açıldığıynan solduğu bir olur. Durnagözlü bulaqların gəlin güzgüsü çoxdan sınıb. Könülsüz-könülsüz ləpələnən Göyçə gölün ayna suları nə müddətdi ki, saz səsinə, aşıq çal-çağırına tamarzı qalıb. Bu yoxluğun, yiyəsizliyin göynərtisi sənin onsuz da pərişan ruhunu bir də tel-tel eləyib. Dörd bir yanına boylanıb eldən-ulusdan hənir gəlmədiyini görüncə bağrından qara qanlar ələnən yaralı ruhunun sorğusuna kim cavab versin?

*Hanı bu yaylaqda yaylayan ellər?*
*Görəndə gözümdən car olur sellər.*
*Seyr etmir köksündə türfə gözəllər,*
*Sancılmır buxağa güllərin, dağlar!*

Güləndamlarını, tellilərini, güllülərini, müşkünazlarını öyüb tərifə tutduğun gül-gülzar yaylaqlarda daha özgə ellər yaylayır, Dədə Ələsgər! Dağlar o dağlar, yollar o yollar, sular o sulardı, amma ellər o ellər deyil. Çarx dönüb, qurğumuz pozulub. Göyçənin beçə balı, üzlü qoyun pendiri, qaymağı könül sızıldadan nisgilə çevrilib. Güneylərin damağa dad gətirən kəklikotusu, quzeylərin loğmanmisal yarpızı, talaların qantəpəri, sarıçiçəyi də eləcə… Çal-çağırlı binələrimiz, oğuz bədöylərinin kişnərtisindən lərzə gələn ormanlarımız, qonaq-qaralı ocaqlarımız xəyal avazıdan əlçatmaz bir keçmişdir daha. Sənin pərişan ruhun da o xətirli-mehirli keçmişin dərvişə dönmüş soraqçısıdır:

*Hanı mən gördüyüm qurğu-büsatlar?*
*Dərdiməndlər görsə tez bağrı çatlar.*
*Mələşmir sürülər, kişnəşmir atlar,*
*Onçun pərişandı halların, dağlar!*

İndi sənin qəm-qubara bürünmüş əhvalın dağlarınkından da pərişandır, Dədə Ələsgər…

Dövranın acı rüzgarları yurd-yuvanı viran, el-obanı sərgərdan qoyandan bəri haqqı nahaqqın pərsənginə keçirən müxənnət zamananın mizanı pozulmuş tərəzisindən də üzün dönüb:

*Müxənnət zamana, beymürvət fələk,*
*Şamı sübhə, sübhü şama çəkirsən…*
*…Seyiddən, molladan, dostdan xəcalət,*
*Bu nə dağdı, sən sinəmə çəkirsən?!*
*…Əzizliknən saxladığın aşığı*
*Zəlilliknən imtahana çəkirsən…*

Belədə Göyçə oğullarını axtarıb əli boşda qalan yaralı ruhun yuvasından perikmiş kimsəsiz bir quşa dönməsin, neyləsin?!

Hanı mərd igidlər, boş qalıb yurdu?...

Niyə dikəlir ruhundan bu göynərtili sual? Köməyəmi çağırırsan mərd igidləri? Olmaya… Olmaya qəbrini… görürsənmi, dilim də gəlmir, ustad. Axı, sənin nurlu qəbrin sazın-sözün müqəddəs haqq ocağıdı. Ocağa əl qaldıranın Allahdan-tanrıdan qorxusu yoxdumu?! Tanrı üzünə ağ olanların bəlasını qadir Allah özü verər, inşaallah.

Amma bir məsələdə sazın-sözün qeyrətini çəkənlərin də günahı çoxdu. Gərək vaxtında duyuq düşüb ruhunun evini Bakıya köçürəydik. Ulu Göyçə yiyəsizlikdən, arxasızlıqdan dağıldı. Dədə Ələsgər, elə sənin məzarın da… Bakıdan, Azərbaycandan haray gəlmədi, yaxın durub, əl tutan olmadı. Yağı da baxdı ki, asanca təkləmək olar Azərbaycanın yiyə durmadığı Göyçəni. Təklədi, dağıtdı da! Qarabağ ermənilərinə Ermənistan əzəlindən qahmar durdu. Min cür hiyləyə, fitnə-fırfldağa əl atıb Moskvanı da özlərinə tərəf çəkdilər. Bizim yelbeyin başbilənlərsə Göyçə, Ağbaba, Zəngəzur, Dərələyəz adı çəkən qeyrətli Azərbaycan oğullarını rus dəyənəkləri ilə yaxşıca əzişdirirdilər. Yadlar-yamanlar bizi bir döyəndə, özümüzünkülər beş döydülər. Beş döydülər ki, düşmən baxıb ləzzət aparsın. Onda sənin incik ruhun da özünü döyülmüş bildi. Bilib də yana-yana haray qopartdı:

*Təbib yoxdu, dərman etsin yaraya,*
*Sızıldaşır yaram a yana, yana!*

Təbib yoxdu… Nə yaman düz tapmısan, ustad! Dərdlərimiz, yaralarımız indi həmişəkindən yüzqat artığıynan təbibə, məlhəmə möhtacdı. Təbibsə yoxdu… Neçə ki, təbib yoxdu, zaman-zaman torpağı-

mızın başı min cür bəlalar çəkəcək, göyçəlilər Göyçə üzünə həsrət qalacaq, sənin müqəddəs qəbrini ziyarətə gedə bilməyəcəyik…

Yəqin xəbərin oldu, Dədə Ələsgər; göyçəlilər arxasız qalıb Göyçədən çıxanda birbaşa Qarabağa üz tutdular. O vaxtlar Azərbaycanın üzdəniraq başda duranları Qarabağ ermənilərini öz ərköyün balaları kimi püfhapüflə əzizləyirdilər. Döyə-döyə başıbəlalı binəva göyçəliləri Qarabağdan da çıxartdılar. Özü də sapı özümüzdən olan baltalar döyüb çıxartdılar. Oğuz eli nə zamandı ki, arada sərgərdandı. Belədən-beləyə, elədən-eləyə yollanan bu müsibətli camaatın başına gələn olub-olmuşlardan xəbər tutan pərişan ruhun dönüb-dönüb yaralanır:

*Köhnə yaram qövr eylədi təzədən…*

Eldən ayrı düşən gündən üzü bu yana pərişan ruhunun ən çox pıçıldadığı bu kövrək misra tanrı dərgahına yüksələn bir dilim yanar ah nisbətindədi. Onun qəm yükünə tən duran bir ayrı nisgilli misran da sənin mübarək ruhundan nigaran olanların dilində əzbərdi:

*El yeridi, yalqız qaldın səhrada…*



# Aşıq ƏLƏSGƏR

## “BƏLİ”, - DEYİB YOL-ƏRKANA GƏLMİŞƏM

“Bəli”, - deyib yol-ərkana gəlmişəm,
Nəqş olub sinəmdə eşqin kitabı.
Çeşmi-nübüvvətə aşiq olmuşam,
Bir suala verrəm yüz min cavabı.

Gövhər sözüm məclislərdə yayılı,
Arif ondan mətləb qanıb ayılı.
İbadət eyləyən mömin sayılı,
Səxavətin ondan çoxdu savabı.

Haqdı sözüm, yetirəsən isbata,
Yemə riba, meyl eləmə qiybata.
Şəriətdə haramdı zina-ləffata,
Ondan bəd yazırlar xəmri-şərabı.

Xaliqindən utan, məndən utanma,
Şəcərətil-mövti heç səhl sanma.
Miyata qail ol, qafil dolanma,
Haqdı mizan, Sirat, qəbir əzabı.

Əgər zərrə qalsa xümsün, zəkatın,
Hərgiz qəbul olmaz sovmü səlatın.
Haqq yanında möhr olunmaz baratın,
Salarlar boynuna odda tənabı.

Dəyəndə yarpağa, səslənər guşun,
Fəhm eylə, cəm olsa idrakü huşun.
Sürüldü karvanın, köçdü tay-tuşun,
Fərmani-qüdrətin budu xitabı.

Aldanma dünyanın bu fənasına,
Gül olmaz gövhərli xəzanasına.
Özün yetir şahın astanasına,
Dərdlərə dərmandı, dərin turabı.

Yazıq Ələsgərəm, zarü binəva,
Elə iş tut, olsun dərdinə dava.
Aldanıbsan nəfsə, tapıbsan hava,
Dərk eləyib qanmayıbsan hesabı.

## BU DÜNYADA ÜÇ ŞEY BAŞA BƏLADI

Bu dünyada üç şey başa bəladı,
Yaman oğul, yaman arvad, yaman at.
İstəyirsən qurtarasan əlindən,
Birin boşla, birin boşa, birin sat.

Ov keçdi bərədən, ata bilməzsən,
Uçdu getdi əldən, tuta bilməzsən.
Yerisən, yüyürsən, çata bilməzsən,
Görürsən ki, baxtın yatdı, sən də yat.

Qılma Ələsgəri məhrumi-didar,
Zülf eylə ləbindən bir busə, ey yar.
İsmin üç hərf ilə eylərəm aşkar,
Biri “kaf”dı, biri “lam”dı, biri – “sad”.

## ÇƏKMƏYƏ

İnsan payız ölə, yazda dirilə,
Zimistanda boran-qarı çəkmiyə.
Günü-gündən işi düşər müşgülə,
Hər kəs namus, qeyrət, arı çəkmiyə.

İncik olma qoca aşığın yaşından,
Vaqif ol könlünün eşq ataşından.
Bülbül gül yolunda keçər başından,
Əgər gül köysünə xarı çəkmiyə.

Eşq ucundan tapdı xatalar məni,
Qul deyə Həbəşdə satalar məni.
Qoyub top ağzına atalar məni,
Bəlkə, canım bu azarı çəkmiyə.

Xəstə könül gəzir bu təmənnada,
Möminlər pənahı, sən yetiş dada.
Mərd iyidə ölüm haqdı dünyada,
Yoxsul olub ahü-zarı çəkmiyə.

Ələsgər, dəstini üzmə damandan,
İstə mətləbini Sahib-zamandan.
Məhəmməd ümməti çıxmaz zindandan,
Ta ki, Ağam Zülfüqarı çəkmiyə.

## DAĞLAR

Bahar fəsli, yaz ayları gələndə,
Süsənli, sünbüllü, lalalı dağlar.
Yoxsulu, ərbabı, şahı, gədanı,
Tutmaz bir-birindən alalı dağlar.

Xəstə üçün təpəsində qar olur,
Hər cür çiçək açır, taləzar olur.
Çeşməsindən abi-həyat car olur,
Dağıdır möhnəti, məlalı dağlar.

Yazın bir ayıdı çox yaxşı çağın,
Kəsilməz çeşməndən gözəl yığnağın.
Axtarma motalın, yağın, qaymağın...
Zənbur çiçəyindən bal alı, dağlar!

Yayın əvvəlində dönərsən xana,
Son ayda bənzərsən yetkin bostana.
Payızın zəmhəri qoyur virana,
Dağıdır üstündən calalı, dağlar.

Gahdan çiskin tökər, gah duman eylər,
Gah gəlib-gedəni peşiman eylər.
Gahdan qeyzə gələr, nahaq qan eylər,
Dinşəməz haramı, halalı dağlar.

Ağ xalat bürünər, zərnişan geyməz,
Heç kəsi dindirib xətrinə dəyməz.
Sərdara söz deməz, şaha baş əyməz,
Qüdrətdən səngərli, qalalı dağlar.

Köçər ellər, düşər səndən aralı,
Firqətindən gül-nərgizin saralı.
Ələsgər Məcnun tək yardan yaralı,
Gəzər səndə dərdli, nalalı, dağlar!

## DƏYMƏMİŞ

Dad sənin əlindən, a qanlı fələk,
Könül həsrət qaldı yara dəyməmiş.
Köhnə yaram qövr eylədi təzədən,
Təbib neştər vurdu yara dəyməmiş.

Gözüm qaldı "əlif", "bey"də, "yasin"də,
Yaradanım, kömək eylə ya sində.
Qaldım səməndər tək qəm dəryasında,
Yandı balü pərim nara dəyməmiş.

Ələsgər, üsyanın çıxıbdı sandan,
Öldürsən zənburu, əl çəkməz şandan.
Hərcayıdan, müxənnəsdən, nadandan,
Nə söz qaldı sənətkara dəyməmiş.

## DÖNÜBDÜ

Fələyin qəhrindən, el töhmətindən,
Dərdim artıb bir ümmana dönübdü.
Dostun firqətindən, yar həsrətindən,
Bahar mana zimistana dönübdü.

Eşqin girdabında düşmüşəm ləngə,
Torbakeşlər tənə qılır peşəngə.
Gürbə şirə dönüb, muşlar pələngə,
Bəqə qızıb kərgədana dönübdü.

Arif, bu sözləri fikr eylə dərin,
Artırma dərdini sən Ələsgərin.
Qiblənüma məhəbbəti dilbərin,
Meyli bizdən qeyri yana dönübdü.

## EYLƏ

Yeri, göyü, ərşi, kürsü yaradan,
Adil padişahsan, ədalət eylə.
Könlümün nöqtəsin çıxart qaradan,
Məni doğru yola dəlalət eylə.

Bir bəlaya düşdüm, candan usandım,
Heç kəsə demədim, ürəkdən yandım.
Bir təmiz ad ilə ellər dolandım,
Nə "çor" deyən oldu, nə "qələt eylə".

Qəddim əyib qəm xirqəsin geyirəm,
Məhəbbət odundan taam yeyirəm.

Leylü-nəhar "ya hu!", "ya hu!" deyirəm,
Çıxıbdı qəlbimdən "ibadət eylə".

Nə bəlaya düşdüm mən baxtı qara,
Eşqin ataşına heç olmaz çara.
Qalmışam zindanda aciz, avara,
Günahkar, sərgərdan, xəcalət eylə.

Xəstə könül, sürün dost irahına,
İslam sərdarına, din pənahına.
Ələsgər, yön çevir şahlar şahına,
Yapış ətəyindən şikayət eylə.

## GƏRƏKDİ

Aşıq olub diyar-diyar gəzənin,
Əvvəl, başda pür kamalı gərəkdi.
Oturub durmaqda ədəbin bilə,
Mərifət elmində dolu gərəkdi.

Xalqa həqiqətdən mətləb qandıra,
Şeytanı öldürə, nəfsin yandıra.
El içində pak otura, pak dura,
Dalısınca xoş sədalı gərəkdi.

Danışdığı sözün qiymətin bilə,
Kəlməsindən ləlü-gövhər süzülə.
Məcazi danışa, məcazi gülə,
Tamam sözü müəmmalı gərəkdi.

Arif ola, eyham ilə söz qana,
Naməhrəmdən şərm eyləyə, utana.
Saat kimi meyli haqqa dolana,
Doğru qəlbi, doğru yolu gərəkdi.

Ələsgər haqq sözün isbatın verə,
Əməlin mələklər yaza dəftərə.
Hər yanı istəsə, baxanda görə,
Təriqətdə bu sevdalı gərəkdi.

## GÖZƏLLƏR

Gözüm gördü, könlüm qəmdən ayıldı,
Çıxdınız qarşıma dəstə, gözəllər!
Camalın şöləsi nuri-təcəlla,
Görsə şəfa tapar xəstə, gözəllər!

Qəmgin idim, sizi görüb gülürəm,
Qaşınız qiblədi, səcdə qılıram.
İkram ilə sizə sarı gəlirəm,
Siz də gəlin asta-asta, gözəllər!

Minəş Günə bənzər, Əsli bir Aya,
Şəms olub, aləmə salıbdı saya.
İncimərəm, qəsəm olsun xudaya,
Qədəm bassa gözüm üstə gözəllər.

Sizi gördüm, çaşdı ağlım, kamalım,
Güllüyə qurbandı dövlətim, malım.
Olmayaydı bir qocalıq, bir ölüm,
Yaşayaydı bu həvəslə gözəllər.

Pərzad məlakədi, Gövhər bir xanım,
Görən kimi getdi dinim, imanım.
Yazıq Ələsgərəm, sərgərdan canım,
Qurban sizin kimi dosta, gözəllər!

## QOCA BAXTIM

Nə sevda tapıbsan, nəyə talıbsan,
Hansı qəflətdəsən, gəl, qoca baxtım.
Ya məndən küsübsən, ya qocalıbsan,
Bu sınıq könlümü al, qoca baxtım.

Çəkilib pünhana deyirsən: "Sən döz",
Qiyamət odundan pisdi tənə söz.
Gümüşüm tunc oldu, zərü-zibam bez,
Qəlp çıxır aldığım mal, qoca baxtım.

Özüm aşıq oldum, oğlum gülləçi,
Bildim ki, qalacaq dövlətin üçü.
Qırıldı mal-qoyun, qalmadı keçi,
İndi də yıxılıb kal, qoca baxtım.

Mardan şirə çəkib, daşdan keçərdin,
Dəryalardan ləlü-gövhər seçərdin.
Pərvazlanıb Qafdan-Qafa uçardın,
Keçən günü yada sal, qoca baxtım.

Təqdir üçün yaxşı deyil bu adət,
Gah çox sevir, gah eyləyir xəcalət.
İyidlər at vermir, gözəllər xələt,
Gəlmir tənbəkiylə bal, qoca baxtım.

Səksəni, doxsanı ötübdü yaşım,
Qovğaya düşübdü bəlalı başım.
Əzrayıl həmdəmim, məzar yoldaşım,
Daha köç təblini çal, qoca baxtım.

Ələsgər kəsilib səbrü aramdan,
Oxlayıbsan, qanlar axır yaramdan.
Sövdə qıl haqq ilə, əl çək haramdan,
Halaldan mətləbin al, qoca baxtım.

## OLACAQDI

Dedim, könül, içmə eşqin camını,
İçsən, dünya sana dar olacaqdı.
Ya dost olma, ya zəhmətdən incimə,
Dost yolunda boran, qar olacaqdı.

Aldanma dövlətə, uyma dünyaya,
Kəsb eylə özünə halaldan maya.
Zinakar, haramxor yetişməz baya,
Dosta xain baxan kor olacaqdı.

Sərgərdan qalmışam mən bu hesabla,
Fələk qurğusuna əhsən, mərhaba!
Novrəstə gözəllər tapmasın hava,
Qönçənin həmdəmi xar olacaqdı.

Hesabdarlar gələr, çəkər hesabı,
Günahkarlar necə gətirər tabı?!
Mizan, suali-Sirat, qəbir əzabı,
Bu işlər qabaqda var, olacaqdı.

Ələsgər, axtarma qüdrətin sirrin,
Zülmətdə işıq var, acıda şirin.
Zikr eylə dilində mərdlərin pirin,
Qorxma, dar günündə yar olacaqdı.

## OLMAZ

Arif məclisində bir söz söylərəm,
Nə hədyan, nə çaşqın, nə qələt olmaz.
Nütfədən pak olan, loğmadan halal,
Mərifət elminə nabələd olmaz.

Bir söz söyləyərəm, ariflər qanar,
Müxənnətlər etdiyindən utanar.
Varlıqda dost olma, yoxluqda kənar,
"İyidəm" deyəndə bu adət olmaz.

O dünyanı, bu dünyanı gözləyən,
Həm savabı, həm üsyanı gözləyən,
Namus qədri bilib, nanı gözləyən,
İnşallah, heç yerdə xəcalət olmaz.

Bir şəxsin sənəti istəmək ola,
Səxavət eyləməz, Hatəm Tey ola.
Dövlət tapa, gədalıqdan bəy ola,
Başı ərşə çıxsa, ədalət olmaz.

Ələsgər, mətləbin Xudadan istə,
Kərəm olmaz müxənnəsdə, xəsisdə.
Bəylik, göylük, səylik olan məclisdə,
Qaç ki, orda xeyir-bərəkət olmaz.



# AŞIQ ƏLƏSGƏRİN HİKMƏT DÜNYASI



*Aşıq Ələsgər türk aşıq sənəti, aşıq poeziyası tarixində böyük xidməti olan şair aşıqlarımızdandır. O, yaradıcılığında müxtəlif mövzulara müraciət etmiş, dərin məzmunlu, biri digərindən gözəl sənət əsərləri yaratmışdır. Aşığın adının dünya ədəbiyyatı klassikləri ilə bir sırada çəkilməyə haqqı var. Şeirlərində ifadə edilən fikirlər ümumbəşəri mahiyyətdədir. O, həm də bu fikirləri özünəməxsus elə bir bədii şəkildə ifadə etmişdir ki, oxucu (dinləyici) heyrətlənməyə bilmir.*

*Ailə-məişətdən tutmuş beynəlxalq aləmə qədər həyatda elə bir vacib məsələ yoxdur ki, aşıq ona toxunub münasibətini bildirməsin.*

*Aşıq insanları ədalətli, mehriban, səxavətli, sədaqətli, işgüzar, qeyrətli, vətənpərvər, böyüklərə hörmət göstərən və s. gözəl ənənəvi keyfiyyətlər sahibi olmağa çağırır, pis əməllərin acı nəticələr verəcəyini onlara dönə-dönə xatırladır.*

*Aşığın yaradıcılığına tərbiyəvi ruh hakimdir. Onun neçə-neçə bəndi, neçə-neçə beyti və misrası xalq arasında atalar sözləri kimi işlədilməkdədir. "Can deməklə candan can əskik olmaz", "Dosta xain baxan kor olacaqdı", "Hər könül özünə bir padişahdı", "Doğru yola əmək çəksən, zay olmaz", "Tərəqqidən təvəllüddü tənəzzül", "Sayğısız iyidi düşmən aldadar" kimi müdrik sözlər həyatın sınaqlarından uğurla çıxmış, aşığın dediklərini təsdiq etmişdir. Belə qiymətli kəlamlardan bir neçəsini oxuculara təqdim etməyi özümüzə borc bildik.*

***İslam ƏLƏSGƏR***

Ağılsız cahalı kirşan aldadar,
Günü keçmiş qarı qız olmaz, olmaz.

* * *

Axund gərək əyri yola getməsin,
Haqqın kəlamına yalan qatmasın.

* * *

Alçaqda dayan ki, çıxasan başa.

* * *

Alimin elmiylə helmi yarıdı.

* * *

Aşığın nisyəsi, namərd ilqarı,
Desələr, inanma, düz olmaz, olmaz.

* * *

Aşıq olub diyar-diyar gəzənin,
Əzəl başdan pür-kamalı gərəkdi.
Oturub durmaqda ədəbin bilə,
Mərifət elmində dolu gərəkdi.

Xalqa həqiqətdə mətləb qandıra,
Şeytanı öldürə, nəfsin yandıra.
El içində pak otura, pak dura,
Dalısınca xoş sədalı gərəkdi.

* * *

Baxt yatanda qohum-qardaş yad olu.

* * *

Bədəsildən hərgiz olmaz heç əsil.

* * *

Bəylik, göylük, səylik olan məclisdə,
Qaç ki, orda xeyir-bərəkət olmaz.

* * *

Bir adamsan, bir adama namə yaz,
Mahalı incidib, eldən danışma.

* * *

Bir qul düz dolansa haqqın yolunda,
Qəza tapmaz, ona bəla yetişməz.

* * *

Bir mərd ilə ağı yesən şirindi,
Yüz namərdlə şəkər yesən, dad olmaz.

* * *

Bivəfadan yar olmaz,
Ömür üzsən yüzhayüz.

* * *

Bivəfanın, müxənnəsin, nakəsin,
Doğru sözün, düz ilqarın görmədim.

* * *

Bu dünyada üç şey başa bəladı,
Yaman oğul, yaman arvad, yaman at.
İstəyirsən qurtarasan əlindən,
Birin boşla, birin boşa, birin sat.

* * *

Bülbül gül üstündə xarı görəndə,
Qan ağlar, ruxsarı yaşa dayanmaz.

* * *

Bülbül gül yolunda keçər başından,
Əgər gül köysünə xarı çəkmiyə.

* * *

“Can” deməklə candan can əysik olmaz,
Məhəbbət artırar, mehriban eylər.

* * *

“Can” deyənə “can” deyinən mərdana,
Baş qoyanın, qoy yolunda başa baş.

* * *

Can qurban eləsən, layiqdi layiq,
Bir yar ki, mətləbi tez qanan ola.

* * *

Comərdin kisəsi, mərdlərin namı,
İnşallah, ölüncə az olmaz, olmaz.

* * *

Çırağın ki, ilahdən a yana,
Ehtiyacın nədi a yağa, yağa.

* * *

Çox gəzmişəm, az görmüşəm danəndə.

* * *

Çox qazansan, az qazansan,
Beş arşın ağdı xələt.
Mal-dövlətə baş endirən,
Əfsana baş endirir.

* * *

"Çor" deyənin nəfi nədi dünyada,
Abad könlü yıxar, pərişan eylər.

* * *

Danışanda doğru danış,
Sözün çıxmasın qələt.

* * *

Doğru yola əmək çəksən zay olmaz.

* * *

Dosta xain baxan kor olacaqdı.

* * *

Dost dostdan inciyər, qəlbində dönməz.

* * *

Dostun məzəmməti adam öldürür.

* * *

Dost odur ki, dosta yalan satmasın.

* * *

Dost uzaq olmaqla könül yad olmaz.

* * *

Dövlətdən qismətin beş arşın ağdı.

* * *

Dövlətə güvənib gül tək açılma,
Çox sənin tək güllər soldu dünyada.

* * *

Düşman günü düşmanınla düşmandı,
Yüz il keçsə, qohum sənlə yad olmaz.

* * *

Eşit bu sözləri, saxla yadigar,
Gözəllərdə həya, iyidlərdə ar.

* * *

Eşqin ataşına heç olmaz çara.

* * *

Eşq oduna düşən aşkara yanmaz.

* * *

Əbəs yerə bivəfaya can dedim,
Zəhmətin çox çəkdim, karın görmədim.

* * *

Ədalət hakimin payi-turabı,
Kamil ustadlara qul kəmtər mənəm.

* * *

Ələsgər, elmində olma nabələd,
Doğru söylə, sözün çıxmasın qələt.

* * *

Əlin vurma gücün yetməyən daşa,
Götürə bilməzsən, zora düşərsən.

* * *

Əndəlib qan ağlar, zəhri çak olar,
Görsə gül üstündə xar nişanası.

* * *

Ərdən boşanmışdan bir az kənar dur.

* * *

Əyləşəndə ağır əyləş,
Danışanda az danış.

* * *

Gah baş olan, gah da düşər ayağa.

* * *

Gədadan bəy olmaz, dəlidən darğa.

* * *

Gədadan bəy olmaz, nakəsdən iyid.

* * *

Görürsən ki, baxtın yatdı, sən də yat.

* * *

Göz gözə baxanda halın soruşa,
Aləm düşman olsa, görüşmək olar.

* * *

Göz gözə baxmasa mehriban olmaz.

* * *

Gül olma dünya malına,
Qalacaqdı dünyada.

* * *

Günhkardı nə ki yoldan azan var.

* * *

Günü-gündən işi düşər müşgülə,
Hər kəs namus, qeyrət, arı çəkmiyə.

* * *

Güzəran xoş olub, gün xoş keçəndə,
Ağ otaqdan tövləxana yaxşıdı.

* * *

Haqdan yanan çıraq bad ilə sönməz.

* * *

Haqq ilə nahaqqı axtaran hakim,
Tapar qulaq ilə göz arasında.

* * *

Haqq, meyi islama haram buyurub,
Dərd tüğyan eləsə, mey içmək olar.

* * *

Haqq-nahaqq seçilər haqq divanında.

* * *

Haqq sözə gərəkdi düz qiymət olsun.

* * *

Haqq verməsə, qonşu payı pay olmaz.

* * *

Hər ağacdan sandal, hər yarpaqdan gül,
Hər torpağın tamı duz olmaz, olmaz.

* * *

Hər ağac kökündən bitər,
Hər meyvə gözlər zatın.

* * *

Hərca dilin salar bəlaya səni,
Çox da bilsən danış az, şair Nağı!

* * *

Hərcayıdan, müxənnəsdən, nadandan,
Nə söz qaldı sənətkara dəyməmiş.

* * *

Hərcayı sözüylə incimə dostdan.

* * *

Hərcayınan aşna olma,
Namərdə bel bağlama.

* * *

Hər kim ki, sidq ilə dilək diləsə,
Əlbəttə, mətləbin ha bular, bular.

* * *

Hər könül özünə bir padişahdı.

* * *

Xeyir çəkməz ustad ilə dəyinən.

* * *

İbadət eləyən mömin sayılı,
Səxavətin ondan çoxdu savabı.

* * *

İkiarvadlılıq mardan acı olu,
Bez geydirsən bir canana, yaxşıdı.

* * *

İki könül bir-birini tutmasa,
Alan da yazıqdı, gələn də yazıq.

* * *

İlqarın dalınca bir baş getməsin,
Onu bir qarpıza dəyişmək olar.

* * *

İncidənlər, incidəcək,
İncidibsən hər kəsi.

* * *

İnşallah, heç yerdə qalmaz avara,
Bir qula ki, Şahi-Mərdan yar olsun.

* * *

İyid cavanlıqda dəli gərəkdi,
Qocaldıqca mərfət tapa, hal bilə.

* * *

İyidlər məğrur olmasın,
Fəthi-nüsrət xudadandı.

* * *

İyid sarsıyarmı baxtı yatmasa.

* * *

Kərəm olmaz müxənnəsdə, xəsisdə.

* * *

Kəsb elə özünə halaldan maya.

* * *

Kibrdən qəlbində bərkitmə barı,
Top dəyər, dağılar bürcü, hasarı.

* * *

Kimi gördün ki, qəzadan
Qurtardı, qaçdı dünyada?!

* * *

Kişi gərək dediyindən dönməsin.

* * *

Kişi gərək zəhmət çəksin, tər salsın,
Süfra açsın, ad qazansın, dər salsın.

* * *

Könlümün şüşəsi saqın ki, sınar,
Toxunarsa ayna daşa, dayanmaz.

* * *

Könül, doğru yoldan gəl olma kənar,
Əyri yola gedən haqdan utanar.

* * *

Qabiliyyətsiz, mərifətsiz qızların,
Yüzü bir dərdimənd dul ola bilməz.

* * *

Qarı düşmən bir də gəlib dost olmaz.

* * *

Qarşı gəlsə həsrət çəkən yar yara,
Ağlı çaşar, səri ay eylər qıj-qıj.

* * *

Qaytarmazlar pirə gələn qurbanı.

* * *

Qədər sənlə gəzəcəkdi,
İstər gir dəryaya gəz.

* * *

Qəlbi düz olanın evi hac olu.

* * *

Qonşuya kəc baxan özü ac olu.

* * *

“Lənət şeytana!” – de, şər işdən əl çək,
Şeytan səni salar ayaq-ayağa.

* * *

Ləzzət verər bal qatanda qaymağa,
Qaymaqdan da ləziz olar narın üz.

* * *

Loğmadan kəc olan, nüftədən əyri,
Yüz dərs olsa, pür kamala yetişməz.

* * *

Məğrurluq eləyən namurad olu.

* * *

Məğrurluq eləyib ustadan demə,
Vaxt olar bir yerdə dara düşərsən.

* * *

Mən aşığam, yasaq yoxdu dilimə.

* * *

Mənim sözüm yoldan çıxan mollanı,
İnşallah, qaytarar müsəlman eylər.

* * *

Mən istərəm alim, mömin yüz ola,
Meyli haqqa doğru, yolu düz ola.
Diliylə zəbanı üzbəüz ola,
Ələsgər yolunda can qurban eylər.

* * *

Mərd iyidə ölüm haqdı dünyada,
Yoxsul olub ahu-zarı çəkmiyə.

* * *

Mömindən törəyən xoş idrak olar.

* * *

Mövladan dərs alan heç düşməz ləngə.

* * *

Mövla məhəbbətin kəsməz sağ ərdən.

* * *

Müxənnəs ilə nakəsin,
Əlinə fürsət keçməsin.
Halalı harama qatır,
Şeytana sovqat aparır.

* * *

Müxənnət qatar aşına
Ağı, gözlə, gözlə sən.

* * *

Nakəs, müxənnətdən mətləb diləmə.

* * *

Namərddə qaydadı, kəsər basdığın.

* * *

Namərdin dünyada çox çəkdim bəhsin,
Namusun, qeyrətin, arın görmədim.

* * *

Namus qədri bilib nanı gözləyən,
İnşallah, heç yerdə xəcalət olmaz.

* * *

Nütfədən qarışan şeyitbaz olar.

* * *

Nütfədən pak olan, loğmadan halal,
Mərifət elminə nabələd olmaz.

* * *

Nütfədən pak olan özü pak olar.

* * *

Nütfəsindən əyri olan,
Tez göstərər isbatın.

* * *

Ov keçdi bərədən, ata bilməzsən.

* * *

Öldürərsən zənburu, əl çəkmə şandan.

* * *

Saygısız iyidi düşmən aldadar.

* * *

Sərraf yüz bəzəsə səngi-siyahı,
Əsli mütəlladı, ləl ola bilməz.

* * *

Sidqini bağlayan Şahi-Heydara,
İnşallah, heç yerdə qalmaz avara.

* * *

Şairin sinəsi haqq bazarıdı,
Satdığı kəlmələr ləl, mirvarıdı.

* * *

Şəryətdə halaldı qisasa qisas.

* * *

Şərü-böhtan doğru yola sığışmaz.

* * *

Tərəqqidən təvəllüddü tənəzzül.

* * *

Tər gəzən dünyada gedər tərsinə.

* * *

Təzə aşnalıqla köhnə dostluğun,
Fərqi var qış ilə yaz arasında.

* * *

Torpaq soyuq, bədən üryan, kəfən yaş,
Tək qalarsan tək məzarın içində.

* * *

Unutma ilqarı, itirmə iman,
İman durar düz ilqarın içində.

* * *

Uzaq vilayətdən qız sevən oğlan,
Yaxın qonşusundan soruş halını.

* * *

Varlıqda dost olma, yoxluqda kənar,
İyidəm deyəndə, bu adət olmaz.

* * *

Yadın oğlu yağlı aşa mehmandı,
Dar günündə görərsən ki, usandı.

* * *

Ya dost olma, ya zəhmətdən incimə,
Dost yolunda boran, qar olacaqdı.

* * *

Yaxşı can yetişsə yaxşı canana,
Həmi gün xoş keçər, həm ay-il eylə.

* * *

Yaxşı yara qismət olmaz yaxşı yar.

* * *

Yalan deyib qeybət etmə,
Rəhmin gəlsin canına.

* * *

Zikirsiz mömini şeytan aldadar.

* * *

Zinakar, haramxor yetişməz baya.

* * *

Zülmətdə işıq var, acıda şirin.

* * *

Zülm ilə, sələm ilə,
Yığıb ziyarata gedən.
Ziyarata getmək deyil,
Urusa sursat aparır.

*İllərin izi var xatirələrdə...*



**Qəzənfər PAŞAYEV**
**filologiya elmləri doktoru, professor**

# AŞIQ ŞƏMŞİR HAQQINDA DÜŞÜNCƏLƏRİM

Keçən əsrin ortaları, daha doğrusu 1956-cı il idi. Kəndimiz yenicə plana köçmüş, evlərə işıq çəkilmiş, bütün evlər radiolaşdırılmışdı. Kəndin radio qovşağı səhər-axşam Bakıya qoşulur, radionun sehri insanları ovsunlayırdı. Bir gün xəbər yayıldı ki, axşam radioda Aşıq Şəmşir oxuyacaq. O vaxtlar bizim bölgədə insanların mənəvi qidası yalnız kitablar və saz-söz olduğundan bütün kəndi maraq bürümüşdü. Bakı Dövlət Universitetinin filologiya fakültəsini bitirib kəndimizə qayıdan dayım oğlu Zakir Xasıyev dedi ki, Aşıq Şəmşir Kəlbəcərdəndir. Səməd Vurğunun dostudur. Səməd Vurğunla deyişməsi də var. İnsanların marağı daha da artdı. Əgər Aşıq Şəmşir dünya şöhrətli şairimizlə deyişibsə, deməli, elə-belə aşıq deyil. İntizarla axşamı gözlədik. Həmin axşam Aşıq Şəmşir dörd-beş aşıq mahnısı oxudu. Onun zil, şaqraq səsi indi də qulaqlarımda səslənir.O vaxtdan yarım əsrdən artıq keçib. Çox şey dəyişib. Dəyişməyən Aşıq Şəmşirə olan hörmət, ehtiram və məhəbbətdir. Şəmşir aşıq sənətinin ağırlığını çiyinlərində daşıyan, onu urvatlandıran aşıq-şair kimi zaman keçdikcə xalqın gözündə ucaldı, saz-söz pərəstişkarlarının qəlbində Dədə mərtəbəsinə yüksəldi. Coşqunluqla yazıb-yaradan, aşıq sənətini inkişaf etdirən Qurbani, Abbas Tufarqanlı, Xəstə Qasım, Alı, Ələsgər, Molla Cümə, Hüseyn Bozalqanlı kimi misilsiz sənətkarların sırasında dayandı. Yeri gəlmişkən onu da bilmək maraqlı olar ki, Aşıq Şəmşirdən sonra aşıq sənətinin memarlarının sırasına

yalnız Mikayıl Azaflı qoşula bildi. Sağlığında klassikləşən hər iki aşıq təkcə aşıq sənətini kamil bilmələri ilə deyil, eləcə də coşğun şairlik təbinə malik olmaları ilə seçiliblər. Təsadüfi deyil ki, hər iki aşıq tədqiqatçılar tərəfindən haqlı olaraq aşıq-şair deyə təqdim olunurlar. O da təsadüfi deyil ki, onların hər ikisi Yazıçılar İttifaqının üzvü olub. Aşıq Şəmşir 1957-ci ildə, Mikayıl Azaflı isə sonralar.



Aşıq Şəmşirə qüdrətli qələm sahibləri: saz-söz sənətini dərindən bilən, ömürlərini bu sənətin, bu sənəti yaradan və yaşadanların tədqiqinə həsr edən alimlər, şair və yazıçılar sanballı əsərlər həsr ediblər. Həmin əsərləri və Şəmşirin yaradıcılığını nəzərdən keçirəndə ürəyimə ilk gələn o oldu ki, fitri istedad sahibi – Azərbaycanın ilk Xalq şairi Səməd Vurğun kimin haqqında nə deyibsə, düz çıxıb. Aşıq Şəmşirin yaradıcılığını bir aşıq və şair olaraq yüksək qiymətləndirməsi, şair Osman Sarıvəllidən Şəmşir haqqında tədqiqat əsəri yazmasını təvəqqe etməsi də onun uzaqgörənliyindən xəbər verirdi. Aşıq Şəmşirin Dədə Aşıqlar dayanan zirvədə dayanacağını Səməd Vurğun şair fəhmi ilə əvvəlcədən görmüşdü. Maraqlıdır ki, şair zamanının bütün görkəmli aşıqları ilə isti münasibətdə olmuş, onlarla oturub-durmuş, ölməz aşıq sənəti barədə söhbətlər etmişdir. Lakin onlarla deyişməmişdir.

Aşıq Şəmşirlə saz-söz sənəti barədə söhbətlərdən, onun aşıq sənətini dərindən bildiyinin şahidi olandan, aşığın təbli şair olduğunu görəndən sonra, indinin özündə belə aşıqların dillər əzbəri olan beş bənddən ibarət qoşma ilə deyişmişlər. Həmin deyişmənin ilk və son beytlərini oxuculara təqdim edirik. Qoy saz-söz xiridarları bir daha şahid olsunlar ki, hər iki şairin qoşmasında məna dərinliyi, dilin şirinliyi, xalq ruhuna yaxınlıq adamı heyran edir.

Səməd Vurğun:

*Aşıq Şəmşir, Dəlidağdan keçəndə,*
*Kəklikli daşlardan xəbər al məni!*
*Ceyran bulağından qızlar içəndə,*
*Saz tutub, söz qoşub yada sal məni!*

Aşıq Şəmşir:

*Qoşqarla yanaşı duran adın var,*
*Bizim el tanıyır uca dağ səni!*
*Elimin, günümün böyük şairi,*
*Bilirik şeirdə bir mayak səni!*

Səməd Vurğun:

*Bəxt məni bu yerə qonaq gətirdi,*
*Gedirəm, yamandı ayrılıq dərdi.*
*Demə, Səməd Vurğun gəldi-gedərdi,*
*Unutmaz bu oba, bu mahal məni!*

Aşıq Şəmşir:

*Şəmşirlə görüşün qaldı yadigar,*
*Unutmaz, nə qədər canında can var.*
*Səndən dərs almağa diyarbədiyar,*
*Gəzərəm əlimdə şam-çıraq səni.*

Xalq şairi Osman Sarıvəlli "Aşıq ürəkli şair, şair ürəkli aşıq Şəmşir" adlı tədqiqat əsərində maraqlı bir məsələdən söz açır: "Aşıq poeziyası ilə məşğul olan alimlərimiz haqlı olaraq deyirlər ki, Səməd Vurğun Kəlbəcərdə Şəmşirlə görüşəndən sonra aşıq çox məşhurlaşmışdır. Bu, həqiqətən belədir. Bu mənada desək, Aşıq Şəmşir xalq şairi Səməd Vurğunun kəşfidir".

Bu bir həqiqətdir ki, Səməd Vurğunla Aşıq Şəmşirin tanışlığı, dostluğu cəmi doqquz ay (avqust 1955 - aprel 1956) çəksə də, ədəbi hadisəyə çevrildi. Dahi şairin "Demə, Səməd Vurğun gəldi-gedərdi" misrası çox mətləblərdən söz açır. Onun Aşıq Şəmşirlə görüşü, sonrakı münasibətləri bir nümunə məktəbidir. Professor Mürsəl Həkimov "Haqq aşığı Dədə Şəmşir" əsərində bu məsələyə işıq tutur. Doğrudan da, Aşıq Şəmşiri Bakıya dəvət etməsi, 20 çap vərəqi həcmində şeirlər kitabını nəşriyyatda plana saldırması, Məmməd Arif, Həmid Araslı, Mirzağa Quluzadə kimi görkəmli ədəbiyyatşünas alimlərlə tanış etməsi, öz maşınında onu şəhərin görməli yerlərinə aparıb göstərməsi, onun Yazıçılar İttifaqına üzv olması məsələsini qoyması Səməd Vurğunun aşıq sənətinə, sənətkara verdiyi qiymətdən xəbər verir. Aşıq Şəmşirin şairin ölümündən sonra ona neçə-neçə şeir qoşması isə aşığın etibarını, düz ilqarını göstərir.

Aşıq Şəmşirlə bağlı bir faktı da göstərmək istərdim.

Mikayıl Azaflının "Qoca Azaflıyam" adlı kitabını ("Nurlan" nəşriyyatı, 2008, 760 səh.) nəşrə hazırlayarkən aşığın arxivində Aşıq Şəmşirin öz xətti ilə yazdığı və Azaflı Mikayıla ünvanladığı deyişmələrinə və şeir-məktubuna rast gəldim. Aşıq Şəmşirin poetik dünyasından xəbər verən deyişmələri və şeir-məktubu məni məftun etdi. Xüsusi vurğulamaq lazımdır ki, Aşıq Şəmşirin Azaflı Mikayılla aşıq poeziyasının ən çətin və mürəkkəb janrı olan təcnislə deyişməsi aşıq yaradıcılığında az təsadüf edilən hadisədir.



Həmin deyişmənin birinci bəndini oxucuların nəzərinə çatdırıram ki, mənim bu fikrimə şahidlik etsinlər:

Aşıq Şəmşir:

*Nə zamandı gəlib həsrəti-didar,*
*Bu gün qonaq gəlib bu dağ, bu dağa.*
*Elə bil gül açıb, gəlibdi bahar,*
*Könül bağçasında budağ-budağa.*

Mikayıl Azaflı:

*Aran da yaxşıdı, dağ da yaxşıdı,*
*Dağ dağa arxadı, aran arana.*
*Düz, əyri, xeyir-şər vaxtın naxşıdı,*
*Salar ayrılığı aran arana.*

O ki qaldı Şəmşirin şeir-məktublarına, onlar ayrı aləmdir. Hərdən fikirləşirəm, Səməd Vurğunun ustad aşığın yaradıcılığına dərin marağı və onu yüksək dəyərləndirməsi belə poeziya nümunələrindən qaynaqlanmırdımı?

Baxın, qiymət verin, görün üçbəndlik bu yığcam qoşmada Aşıq Şəmşir Azaflı Mikayılı Kəlbəcərə necə dəvət edir. Şeirin axıcılığı, təbiət təsvirləri, məna, məzmun çalarları adamı heyran edir, aşıq-şairin çeşməyə bənzər təbindən, şairlik istedadından xəbər verir:

*Çəmənə, çiçəyə bəzənib hər yan,*
*Sən bizim dağlara yaz olanda gəl.*

*Lalə, nərgiz açılanda ərməğan,*
*Boran bu yerlərdə az olanda gəl.*

*Bənövşə kollara sarışan zaman,*
*Əliklər meşədə bağrışan zaman,*
*Çöllərdə çalxanıb çağrışan zaman,*
*Çayların üstündə qaz olanda gəl.*

*Xəstəlik əlində belə çaşbaşam,*
*Axı, bacarmıram sellənib daşam.*
*Müddətdi yatıram, hələ naxoşam,*
*Şəmşirin əlində saz olanda gəl.*

Yuxarıda göstərmişik ki, aşıq poeziyasının elə bir janrı yoxdur ki, Aşıq Şəmşir orada uğurla qələm çalmasın. "Folklorumuzda yerini tutmamış bir janr" adlı məqaləmizdə, sonralar isə "Kərkük folklorunun janrları" kitabımızda Aşıq Şəmşirin "bayatı-tapmaca"lar da yazdığını göstərmişik. Lakin tədqiqatçılarımız onları bayatılar qismində verdiklərindən açması verilməmişdir. Biz bu münasibətlə yazmışıq: "Azərbaycanda folklorşünaslığa dair son vaxtlar çap olunan kitablarda "bayatı-tapmaca"ların açmasını verməmək meyli özünü göstərir. Hətta Aşıq Şəmşir kimi müasirimizin belə "bayatı-tapmaca"larının açmasının verilməməsi təəssüf doğurur. Məsələn:

*Ayağı, əli qandı,*
*Dodağı, dili qandı.*
*Möcüzə dərya gördüm,*
*Suyu duz, gülü qandı.*

*İki at var uzaqda,*
*Bərqərardı hər vaxtda.*
*Qarası adam yıxar,*
*Ağı gəzər qucaqda.*

(Bax: Aşıq Şəmşir. Şeirlər. Bakı, Yazıçı, 1980, s.240-241)

Halbuki, "bayatı-tapmaca"ların açmasının verilməsi həm insanı düşünüb-daşınmağa sövq etmək, həm də ona təbiət və cəmiyyət hadisələri, xalqın həyat tərzi, fikri-düşüncəsi barədə məlumat vermək baxımından maraq doğurur, tədqiqatçılar üçün əvəzsiz xəzinə-

yə çevrilir. Digər tərəfdən də vəzn və qafiyəsi yerli-yerində olan bu qiymətli poetik parçaların açması məlum olduqda dillər əzbərinə çevrilir, daha geniş yayılır" (Bax: Kərkük folklorunun janrları. Bakı, "Elm" nəşriyyatı, 2003, səh.178-179).

Aşıq Şəmşirin "bayatı-tapmaca"larından da göründüyü kimi, bəzən sadə, bəzən də yüksək poetik dillə yazılan, təşbeh və təsvirlərlə, obrazlı ifadələrlə dolu olan bu dördlüklər, ağlı, zəkanı, düşüncə və mühakiməni inkişaf etdirmək baxımından xüsusi qiymət kəsb edir.

Əziz saz-söz sərrafları, dənizin suyunun duzlu olduğunu bilmək üçün bir damcı kifayət etdiyi kimi, şeirin də əsl poeziya nümunəsi olduğunu bilmək üçün bir bənd kifayət edir. Aşıq Şəmşirin hansı bəndini, hansı şeirini götürsək görərik ki, əsl poeziya nümunəsi olmaqla bərabər xalq ruhunda köklənib. Yayda bulaq suyu insanın ürəyinə necə yayılırsa, Şəmşir poeziyası da qəlblərə məlhəm kimi eləcə yayılır.

Çəkinmədən deyə bilərik ki, bütün aşıq şeir şəkillərindən məharətlə istifadə edən, təkrarsız poeziya nümunələri ilə XX əsr Azərbaycan aşıq poeziyasının inkişafında xüsusi yeri olan Aşıq Şəmşir o xoşbəxt taleli sənətkarlardandır ki, aşıq sənətinə verdiyi töhfələri sayəsində ozan-aşıq sənətinin memarlarının bərqərar olduğu zirvədə layiqli yerini tutmuşdur.





Şakir NADİROĞLU

# MÜƏLLİMSİZ ÜŞÜYƏN MƏKTƏB

Kamandar Əfəndiyev. Bütün titullardan, bütün adlardan ucada duran bir isim... Türkün sazının işlədiyi bütün məmləkətlərdə bu adı çəkmək kifayətdir ki, səni ikiqat ağırlasınlar, hörmət etsinlər. Düzdü, Kamandarın Kamandarlığını qısqananlar da yox deyil, bu adın qarşısına keçə bilməyib kölgəsini qılınclayanlar da var. Ancaq Kamandar səsinin ildırım nərəsi, dəli Kürlüyü, bulaq saflığı, şəlalə eydirməsi hamını bir fikirin işığına toplayır: “Zalım oğlu, doğrudan da Haqq aşığıdı!”

Kamandar Əfəndi oxumur, o, sazın tellərinə qarışıb sözün özündə yaşayır. Ona görə də onun oxuduğu hər mahnı sağlığında hadisəyə çevrilirdi. Ustad “Dubeyti”də sazın səsiylə dağları oxşayır, güllərə layla deyirsə, “İbrahimi”də səsin eydirməsiylə dağlara heykəl qoyur, birdən də dönüb yana-yana Qəribi anasına qovuşdurur...

Xan Kamandar Kürüstü Kəpənəkçidə (Borçalı) doğuldu, orda da dünyasını dəyişdi. Amma şöhrəti təkcə Borçalını, Azərbaycanı deyil, bütün türk danyasını bürüdü. Bu şöhrəti ona heç kim verməyib, ustad alın təriylə, sənətini sevməsiylə və ən başlıcası mənsub olduğu xalqın sevgisiylə qazanıb o şöhrəti...

XX əsrin sonlarında ustad aşıqlar Hüseyn Saraçlı və Əmrah Gülməmmədov dünyalarını dəyişdilər. Və bundan sonra Borçalı aşıq mühitinin bütün ağırlığı bir ustadın – Kamandar Əfəndinin çiyinlərinə düşdü. Bu mühitin həm dastançılığını, həm ifaçlığını, həm də ustadlığını öz çiyinlərinə götürdü Kamandar Əfəndi. Sağında, solunda heç kəs yoxuydu, meydanda təkləndikcə sazına sığındı, səsinə

mətərisdəndi... Gücünü el-obadan aldı. Zəmanənin dönüklüyü onu sıxsa da, şöhrətin zirvəsindən endirəmmədi.

Məncə bu yerdə haşiyə çıxaraq bir-iki əhvalata müraciət etmək yerinə düşər.



Kürüstündə Kamandarın iki çox yaxın uşaqlıq dostu olub. Böyüyəndən sonra hərəsi bir peşə sahibi olsa da, yaxınlıqları davam edib. Payız vaxtı üç dost Ehram çayını keçib Qarayazı meşəsinə ova çıxırlar. Əslində ov bəhanəydi. Dostları aşığın başını qatmaq üçün onu kənddən çıxarmışdılar. Axşama yaxın payızın sazağı iliklərinə işləyir. Qayıdanbaş çayı ayaqlarını soyunub keçməli olurlar. Dostlar iki ayağını bir başmağa dirəyir ki, sənin əşyalarını da, özünü də biz keçirəcəyik, sənin səsin təkcə sənə aid deyil, biz onu qorumalıyıq. Beləcə, dostların biri əşyaları götürür, biri də ustadı arxasına alıb çayı keçirirlər.

Bəlkə də bu hadisə bəzilərinə qəribə görünəcək. Ancaq, həqiqətən Borçalıda ustadı əllərində saxlayırdılar, sonsuz məhəbbətlə sevirdilər və yenə sevirlər... Xalqın öz sənətkarına olan sevgisini kimi yana-yana, göynəyə-göynəyə yaşadır, kimi də sinəsində qorranan odu aşığın lentin yaddaşına köçən ifalarını dinləyə-dinləyə söndürməyə çalışır. Kimi də təsəllisini xatirələr də tapır...

Ustadın başqa bir dostu, 25 il aşığın yaradıcılığını addım-addım izləyən Dünyamalı müəllim söyləyir ki, aşıq Bakıya gəlmişdi. İş elə gətirdi ki, ustad on gün ləngiyəsi oldu.

Kürüstünə obaşdan çatdıq. Mal-heyvan damnan təzə çıxırdı. Kəndin qulağındaca çoban çomağını uzadıb maşının qabağını kəsdi.

Maşını saxladıq. Çoban yüyürüb aşıq olan tərəfdən maşının qapısını açdı, həyəcanla: "Allan səni saxlasın, kəndi başlı-başına qoyub neçə gündü hardasan? Sənsiz yaman darıxmışıq", - dedi.

Bax, ustadın sənətinə, şəxsiyyətinə xalq sevgisi buydu. Bu sevgi Kamandar üçün bütün titullardan üstünüydü. Bütün yaradıcılığı boyu ustad çalışdı ki, bu sevgi əskilməsin, əksinə çoxalsın. Çünki, o da öz xalqını sevirdi.

Xalq şairi Zəlimxan Yaqub ustadı xatırlayarkən bir əhvalat danışdı. Günlərin bir günü ustadın şirin söhbətini dinləyə-dinləyə talvarın altında əyləşib nərd oynayırdıq. Dostlardan biri bizi günorta bulaq üstə qonaq dəvət etdi. Ustad hazırlaşmaq üçün otağa keçdi. Bir saat keçdi, gəlmədi. Məndən xahiş etdilər ki, aşığı tələsdirim. Qapını açanda nə görsəm yaxşıdı. Əynindəki paltar suyun içində, ustad vurha-vur çalıb-oxuyur.

Ərkyana dedim: "Ay ustad, bayaxdan səni gözləyirik. Sən neynirsən?"

Ustad dedi: "Ay oğul, sən hələ cavansan. Xalqın sevgisini qazanmaq asandı, saxlamaq çətin. Bulaq üstə yəqin ki, bizdən başqa da adamlar olacaq. Və mənim orda olduğumu eşidib hansısa ifanı istəyəcəklər. Mən də ən azından bilməliyəmmi səsimin zili, bəmi bu gün necədir? Hələ hansı sözü, hansı havada oxuyacağımı demirəm... Bir də ki, mənim üçün böyük, xırda məclis yoxdur, çünki, hər məclis mənim üçün bir imtahandır."

Bax, ustadlıq da, böyüklük də, dədəlik də, hikmət də budur...

Şairin başqa bir xatirəsini dinləyək.

Məclislərin birində ustad yenə özünəməxsus cövlan edir. "Divani", "Təcnis", "El havası", "Ruhani" - ifalar bir-birini əvəzləyir. Məclis elə bil donub. Hamı Kamandar səsinin sehrinə düşüb. Növbəti ifada ustad bəndin birini oxumadı. Məclisdən sonra dedim: "Ay ustad, filan qoşmada filan bəndi niyə oxumadın?"

Dedi: "Filan cərgədə bir adam varıydı. Allah onu övlad imtahanına çəkib. O bəndi oxusam, ona toxuna bilərdi."

Allah!...Allah!.... Mərifət, hikmət, təriqət, əxlaq bu deyilmi?!..

Xatirələri dinlədikcə Kamandar səsinin ucalığında dayanıb şəxsiyyət və sənətkar bütövlüyünə qibtə edirsən. İlahi! Bu nəyiymiş, bu kimiymiş?!... Kərəmi oxuyur, öz ahından alışıb Kərəm tək külə dönür, Koroğlu oxuyur, deyirsən Koroğlu elə indicə Babəkər dağını yarıb bəri gəlib, "Ruhani" oxuyur, aman Allah!.. ruhun tufanı baş-

layır. İlahi, vaxtında dəyər verə bilmədiyimiz bu səs nə möcüzədi?!..

Borçalıda müəllimsiz qalan bir məktəb var - Kamandar məktəbi. Bu məktəbin yetərincə şagirdi olsa da, otaqları müəllimsiz üşüyür...

## *KAMANDARIN OZAN SƏSİ*

*Könüllərdə heykəlləşib*
*Kamandarın ozan səsi.*
*Borçalıda gerçəkləşib*
*Kamandarın ozan səsi.*

*Rəbbim verib, Haqdan gəlib,*
*Göydən enib, Yerdən gəlib,*
*Bir ilahi nurdan gəlib*
*Kamandarın ozan səsi.*

*Haqq səsidi, qalar bu səs,*
*Zirvələri aşar bu səs,*
*Əbədidir, yaşar bu səs,*
*Kamandarın ozan səsi.*

*Özü yoxdu, məktəb qalıb,*
*Dəftər qalıb, kitab qalıb,*
*Bir xəzinə, dövlət qalıb –*
*Kamandarın ozan səsi.*

*Şakir, göynər göyüm-göyüm,*
*Yerdə yerim, göydə göyüm.*
*Oyar qəlbim oyum-oyum*
*Kamandarın ozan səsi.*



**Əlisahib ƏROĞUL**
**yazıçı-publisist**

# AŞİQLƏR AŞİQİ AŞIQ PƏRİ

Xan Arazın xan qızı kimi doğulan, təbi İlahi vergidən gələn, bədahətən şeirlər deyən Aşıq Pəri Azərbaycan aşıq şeirinin ən görkəmli nümayəndələrindən biri, qadın aşıq sənətinin isə yaradıcısı və banisidir. Çoxsaylı tədqiqatçılar, ədəbiyyatşünaslar, ədəbiyyatçılar Cəbrayılın bu inci xanımının həyat və yaradıcılığı haqqında nə qədər ziddiyyətli məlumatlar versələr də, doğum-ölüm tarixi ilə bağlı müxtəlif tarixlərdən bəhs etsələr də, aşağıdakı fikirlərdə yekdildirlər ki, Aşıq Pəri həm şeir pərisi, həm də gözəllik pərisi olmuş, şeir, sənət xiridarı olan kişi müasirləri ilə söz döyüşündən həmişə qalib ayrılmış, aşıq şeirinin ilhamvericisi kimi ad çıxarmışdır. Onun hər bir şeiri ədəbi mühitdə dərhal əks-səda doğurmuş, bir neçə yeni şeir və deyişmənin yaranmasına səbəb olmuşdur. Söz cəngavərləri Aşıq Pəri poeziyasına, onun müstəsna istedadına və məftunedici gözəlliyinə həsəd aparmış və ona mədhiyyələr həsr etmişdilər. Görkəmli alman şərqşünası A.Berje 1867-ci ildə Leypsiqdə nəşr etdirdiyi "Məcmuəyi-əşari-şüərayi-Azərbaycan" adlı məcmuədə yazırdı: "1829-cu ilin axırlarında Araz çayı sahillərində uzanan Maralyan kəndində 18 yaşında bir qız zühur etdi. Eşidilməmiş bir gözəlliyə malik olan bu qızın adı Aşıq Pəri idi... Onun deyişmələri, hazırcavabcasına dediyi şeirləri diqqəti cəlb edirdi. Öz dövrünün az-çox istedadlı şairləri ilə şeirləşmədə həmişə müvəffəqiyyət qazanırdı və heç kəsin ona qalib gəlməsinə imkan verməzdi". Böyük ədəbiyyatşünasımız Firudin bəy Köçərli isə 1903-cü ildə yazırdı: "Özünün ağıl və istedadı ilə çoxlarında heyrət doğuran gözəl və gənc şairə Aşıq Pəri o zamankı savadlı və təhsil görmüş ədəbi simaların diqqət mərkəzində dayanırdı..."

Aşıq Pəri yaradıcılığının tədqiqatçıları, daha doğrusu pərişünaslar bir mənalı şəkildə təsdiq edirlər ki, Aşıq Pəri Qarabağın, Dizaq mahalının,

Şuşa qəzasının Vərənd sahəsinin, Cəbrayıl qəzasının və nəhayət, hər dövrün inzibati ərazi vahidinə uyğun olaraq Cəbrayıl rayonunun Maralyan kəndində anadan olmuşdur (Aşıq Pəri bütün bunlarsız da Maralyandan olduğunu şeirlərində göstərir:



*Pərinin dərdi tüğyandır,*
*Sakin yeri Maralyandır.*
*Gülüm qönçəsində yandı,*
*Bülbüllər əfqan eylədi.)*

Kiçik yaşlarında ruhani təhsili almış, daha doğrusu mollaxanada oxumuş, ərəb, fars dillərini mükəmməl öyrənmiş, türkcə yazı vərdişinə yiyələnmiş, bədahətən şeirlər deməyə və yazmağa başlamışdır. Maralyan kənd məktəbində bir müddət müəllim işləmiş, həmin əraziyə yaxın bələdçiliyi olan, o ətrafda yerləşən Horovlu kəndinin yetirməsi, fəlsəfə elmləri namizədi Əli Behbudov "Kolxozçu" qəzetinin 07 və 09 dekabr 1982-ci il tarixli saylarında dərc etdirdiyi "Aşıq Pəri Maralyanlı" məqaləsində yazır ki, Aşıq Pərinin atası sövdagər - xırda alverlə məşğul olduğundan ona kənd arasında tacir Hacı Sayad deyərmişlər. Anası Gülüstan zəmanəsinin mütərəqqi qadını olmuş, qızının natiq danışmasına, oxuyub təhsil almasına maneçilik etməmişdir.

Pərişünaslar yekdilliklə qeyd edirlər ki, Aşıq Pəri şeirləşmələrdə iştirak etmiş, aşıqlıq sənətinin sirlərinə dərindən bələd olmuş, özünəməxsus şəkildə saz çalmış, rəqs etmiş, məlahətli səslə oxumuş, toy-düyünlərə çağırılmış, o dövrün çalğıçıları ilə məclislər aparmış, aşiqanə davranışlara malik olmuşdur. Sözsüz ki, o dövrdə Aşıq Pərinin rübənd vurmadan, çadraya bürünmədən, qıvraq geyimdə meydana çıxması, toylarda, məslislərdə çalıb-oxuması bir inqilab, dövrünün görünməmiş bir hadisəsi idi. Cəbrayıllı mütəfəkkir, fəlsəfə elmləri namlzədi Əşrəf Mehdiyev "Kolxozçu" qəzetinin 29 sentyabr 1963-cü il tarixli sayında dərc etdirdiyi "Aşıq Pəri" məqaləsində yazır: "Şairənin evinə dövrün qabaqcıl ziyalıları, şair dostları gəlib-getmişdi. Bu isə böhtanlara, ləkə yaxmağa səbəb olmuşdur. Bunu Aşıq Pərinin öz qonşusuna qarşı yazdığı şeirdən görmək olar:

*Məni dərdə salan qonşu,*
*Görüm üzün qara olsun.*

*Danışıbsan yalan, qonşu,*
*Görüm üzün qara olsun.*

Ümumiyyətlə, müəlliflər Aşıq Pərinin yersiz hücumlara məruz qaldığını qeyd edirlər. Hətta günü bu gün də müasirlərimizdən Aşıq Pərinin bostanına daş atanlar tapılır. Bu xoşagəlməz məsələ ilə bağlı həmyerlimiz, filologiya elmləri üzrə fəlsəfə doktoru Tariyel Abbaslı "Mingəçevir leysanı" adlı ədəbi-bədii jurnalın 2010-cu ildə nəşr edilmiş 8-ci və 9-cu saylarında dərc etdirdiyi "Aşıq Pəriyə böhtan atmayın" məqaləsində ətraflı bəhs edir. Halbuki bu gün gec də olsa söhbət Aşıq Pəri sənətkarlığının böyüklüyündən, sənət dünyasına qoyub getdiyi dəfinəsinin üzə çıxarılmasından, bədii təkamülümüzün tərəqqisi yolunda oynadığı rolundan, ulu söz ustadının ədəbi sənətkarlığının tədqiqindən getməlidir.

Aşıq Pəri əsasən aşiqanə və aşıq şeiri səpgisində lirik şeirlər yazmışdır. Onun şeirlərində bir tərəfdən saf məhəbbət, ana təbiət, dostluq, ədalət, təmiz və ülvi insani hisslər tərənnüm olunur, digər tərəfdən isə dünyanın vəfasızlığından, ölümün amansızlığından, hakimlərin zülmündən şikayət edilir. O, yeri gəldikcə bənzərsiz şeirlərində klassik və xalq şeir ənənələrindən, atalar sözü və hikmətli sözlərdən məharətlə istifadə edir. Həyatilik və səmimilik onun şeirlərinin əsas xüsusiyyətlərindəndir. İncə və həssas şeirlərini səlis, sadə xalq dilində yazmışdır. Bir sözlə, Aşıq Pəri şeiri xalqın şüurunda dərin izlər salmışdır. Ölməz şeirləri dildən-dilə gəzmiş, nəsildən-nəslə keçmişdir. Əfsuslar olsun ki, Aşıq Pərinin yaradıcılıq irsi yazılı ədəbiyyat yolu ilə bütövlükdə bu günümüzə gəlib çıxmamış, çoxu itib-batmışdır. Külliyatının tərtib edilib üzə çıxarılmasında dövlət səviyyəsində addımlar atılmamışdır.

Aşıq Pəri müasirlərindən Məhəmməd bəy Aşiq (1776-1861), Cəfərqulu ağa Nəva (1786-1858), Mirzə Həsən Mirza (1786-1830), Tüfeyli, Əsəd bəy və Azərbaycan dilində şeirlər yazan erməni Mirzəcan Mədətov kimi şairlərlə yaxın dost olmuş, onlarla bir neçə dəfə deyişmiş və məktublaşmışdır. Həm də görünür Aşıq Pəri şeirlərində mürşidi-kamilim adlandırdığı, Qarabağ aşıq məktəbinin nümayəndələrindən biri Məhəmməd bəy Aşiqdən aşıq sənətinin sirlərini öyrənmiş, o dövrdə Qarabağda geniş yayılmş "Vəlican", "Nağıl kəsməşikəstə", "Güllü qafiyə", "Qara qafiyə" kimi saz havalarını cürə sazda çalma və məclis aparma qaydalarını da kiçik yaşlarında məhz ilkin olaraq ondan əxz etmişdir. Qeyd etmək yerinə düşər ki, artıq XX əsrin əvvəllərindən başlayaraq Qarabağ aşıq məktəbinin nümayəndələri nədənsə, cürə sazı da tarla əvəz etmiş, dastanlarımızın deyişmə hissələrini bu simli alət havasında çalıb-oxuyub

dinləyicilərə çatdırmağa üstünlük vermiş, həm də məclislərdə xanəndə qismində də çıxış etmişlər.

Aşıq Pərinin şeirləri hələ keçən əsrin ortalarından ədəbiyyatçıların diqqətini cəlb etmişdir. 1856-cı ildən başlayaraq demək olar ki, bütün təzkirə və ədəbiyyat müntəxabatlarında şairənin şeirlərindən nümunələr verilmiş, müəlliflər tərəfindən Aşıq Pərinin adı qürur və iftixar hissləri ilə çəkilmişdir. Elə Aşıq Pəri haqqında ilk məlumatı M.Y.Nersesov 1856-cı ildə Teymurxanşurada (indiki Şimali Qafqazın Buynaksk şəhəri) çap etdirdiyi "Məcmueyi-Vaqif və müasirani-digər" adlı məcmuəsində vermişdir. Aşıq Pəri yaradıcılığı ilə yuxarıda adları qeyd olunanlarla yanaşı Mir Möhsün Nəvvab, Salman Mümtaz, Əlabbas Münzib ("Aşıq Pəri və müasirləri" kitabı), Məhəmmədağa Müctəhidzadə, prof. Əzizə Cəfərzadə ("Azərbaycanın aşıq və şair qadınları" kitabı), prof. Sədnik Paşayev ("Azərbaycan qadını" jurnalı), Şəhriyar Quliyev və başqaları ("Cəbrayıl" adlı tarixi oçerk kitabı), İsmayıl Kazımov və başqaları ("Cəbrayıl və Cəbrayıllılar" kitabı) kimi tədqiqatçılar da məşğul olmuşlar. Ötən əsrin sonlarına yaxın unudulmaz el sənətkarı Narınc Xatun Aşıq Pərinin xatirəsini yaşatmaq üçün Respublika miqyasında fəaliyyət göstərən "Aşıq Pəri" məclisi yaratmışdır.

Son illər gec də olsa həmvətənliləri də Aşıq Pərinin adının əbədiləşdirilməsi yolunda bir sıra addımlar atmış, işlər görmüşdülər. Ötən əsrin 80-ci illərinin sonlarında Aşıq Pərinin Maralyan kəndinin qədim məzarlığındakı qəbir yeri müəyyənləşdirilərək kənd camaatının ziyarətgahına çevrilən məqbərə inşa edilmişdi. Maralyan kənd orta məktəbinə Aşıq Pərinin adı verilmiş, birtipli layihə əsasında tikilmiş ikimərtəbəli məktəb binasının güllü-çiçəki həyətində Aşıq Pərinin tanınmış heykəltaraş Xanlar Əhmədov (bəzi mənbələrdə səhvən Ömər Eldarov getmişdir) tərəfindən hazırlanmış əzəmətli heykəli ucaldılmışdır.

Bütün bunlara baxmayaraq qeyd etmək lazımdır ki, özündən sonrakı nəsillər üçün əvəzsiz bir xəzinə, məxəz qoyub getmiş Aşıq Pəri yaradıcılığı lazımi səviyyədə tədqiq olunmamış, ədəbi ictimaiyyət Aşıq Pəri fenomeninə hələ də layiq olduğu dəyəri yetərincə verməmişdir. Bu gün isə daha böyük, acınacaqlı bir durumla üz-üzəyik. Aşıq Pəri ruhu, onun müqəddəs məqbərəsi, əzəmətli heykəli, adını daşıyan məktəb-məbədimiz hələ də düşmən tapdağı altında inildəyir.

Dövlət tarix arxivində araşdırmalar apararkən mənə məlum idi ki, çar Rusiyası tərəfindən Azərbaycanda əhalinin siyahıyaalınması zamanı sonrakı illərdən fərqli olaraq 1842-ci ildə kişilərlə yanaşı ailələrdəki qadınlar da adbaad qeydiyyata götürülmüşdür. Aşıq Pəri haqqında bu yazını işləyərkən fond 29-da saxlanan kameral kitaba və orada Maralyan kəndində

yaşayan əhalinin qeydiyyatı siyahısına baxmaq qərarına gəldim. 3, 17 və 20-ci sıralarda 3 Pəri adına rast gəldim. Ailə başçısı kimi 3-cü sırada qeydə alınmış Pəri adlı qadın barəsindəki məlumatların, pərişünasların demək olar ki, bütün parametrlərinə uyğun gəldiyini müşahidə etdim. Əlinin dul qadını kimi qeydə alınan bu qadının 40, oğlu Məhərrəmin 25, oğlu Əlinin 12 yaşda olduğu göstərilir. Sonra qeyd aparılır ki, 40 yaşlı Pəri və 12 yaşlı kiçik oğlu Əli vəfat etmişdir. Aşıq Pərinin ölümü ilə əlaqədar professor Əzizə Cəfərzadə yazır: "...bütün mənbələr onun gənckən vəfat etdiyini göstərirlər. Təxminimizə görə bu, ötən yüzilliyin qırxıncı illərinə təsadüf edir." 1849-cu ilin syahıyaalınmasında görsənir ki, oğlu Məhərrəm həyatını davam etdirir. Professor Sədnik Paşayev Aşıq Pərinin oğul nəticəsindən söz açır. Pərinin kiçik oğlu Əli isə həyatını 12 yaşında qeyb edir. Aşıq Pəri "Eylədin" adlı şeirində oğlunun ölümünə bais olmuş ağacı yamanlayaraq yazır:

*Balam kimi növcavanı*
*Yer ilə yeksan eylədin.*

Məntiqə söykənərək siyahıda qeydə alınan Pəri haqqında daha nələr söyləyə bilərik: (1) Böyük oğlunun 25 yaşda olması onu göstərir ki, Pəri 14-15 yaşlarında ərə gedib; (2) boylu (hamilə) Pəri həyat yoldaşını 18-20 yaşlarında itirdiyindən kiçik oğlu dünyaya gəlir və ona ərinin adını qoyur. Alman şərqşünası A.Berje yazır ki, Aşıq Pəri 18 yaşında zühur elədi. Əgər qeydiyyatdakı Pərini Aşıq Pəri hesab etsək, ağlabatan fikirlər söyləyə bilərik. Hələ kiçik yaşlarından oxuyub-çalmağı öyrənən və şeir-sənət xiridarı olan Aşıq Pəri dul qaldıqdan sonra həm ailəsini dolandırmaq, həm də coşub-daşan içini boşaltmaq üçün aşıq tək meydana çıxmağa məcbur idi. Pərişünasların yazdıqları kimi, təbi vergili olduğundan bədahətən söz deməsi, toy-düyünlərdə çalıb-oxuması, şeirləşmə, deyişmə məclislərində iştirak etməsi, hazırcavablığı tez bir zamanda onu bütün Qarabağda məşhurlaşdırmışdır. Əlbəttə, Aşıq Pərinin o dövrün çərçivəsinə sığmayan açıq-saçıq geyinib-gəzməsi, bəzənməsi, ədəbi dilə sığmayan sözlərlə o dövrün kişi aşıq və şairləri ilə deyişmələrə çıxması, onlarla oturub-durması, dostluq etməsi, özünü nə qədər kəskin aparsa da, yerli-yersiz hücumlara məruz qalacağı gözlənilən idi. Görünür mühafizəkar həmkarlarının, həmkəndlilərinin yersiz və haqsız hücumlarından, arada gəzən dedi-qodulardan, sözbazların xoşagəlməz söz-söhbətlərindən qorunmaq üçün aşiqlər aşiqi Aşıq Pəri könül verib-verməməsindən asılı olmayaraq özünə münasib bildiyi, Molla Məmməd Fəqir imzası ilə cızma-qara şeirlər yazan həmkəndlisinə ərə getməyə qərar verir. Lakin

evlilikdən sonra Molla Məmməd Fəqir öz qısqanclığı ucbatından Aşıq Pəriyə göz verib işıq vermir, ağ gününü qara əsgiyə bükür, onu məclislərə buraxmır. Hətta şeir yazmağı belə ona qadağan etmə cəhdi ilə aşiqlər aşiqi Aşıq Pəriyə bir sürgün həyatı bəxş etmiş olur. Onu vərəmlədir və gənc yaşlarında həyatını qeyb etməsinə səbəb olur. Filologiya elmləri üzrə fəlsəfə doktoru Tariyel Abbaslı 2009-cu il tarixli "Mingəçevir leysanı" ədəbi-bədii jurnalının 4-cü sayında dərc etdirdiyi "Maralyanlı Aşıq Pəri" məqaləsində yazır: "...Molla Məmməd adlı birisinə könlü olmadan ərə gedən sərv boylu şairə, onun işgəncələrinə tab gətirə bilmədiyindən sənət aləmindən də uzaqlaşdı və cavan yaşlarında dünyasını dəyişdi. Molla Məmmədə həsr etdiyi bir şeirdə şairənin müsibətli ailə həyatı indinin özündə də adamın ürəyini sızladır:

*Sarıbalaq, nə durmusan qəsdimə,*
*Qəm ləşkəri hücum çəkir üstümə.*
*Heç qoymursan qələm alım dəstimə,*
*Ərzi-halım bəyan edim, neyləyim?.."*

**Söz ardı:** Əlbəttə, 1842-ci ilin siyahıyaalmasında yaşın 40 yazılması təqribidir. Ölüm qeydiyyatı da ola bilsin ki, 1849-cu ildəki siyahıyaalma zamanı artıq həmin adamların vəfat etməsi ilə əlaqədar olaraq aparılıb. Ona görə də mən ziyalıların və Maralyan kənd sakinlərinin ümumi rəyinə əsaslanaraq Aşıq Pərinin doğum və ölüm tarixlərinin onun məqbərəsi üstündə və heykəlinin podstamentindəki 1813-1848 rəqəmləri ilə tam razılaşıram və bu cür də yazılmasını qəbul edirəm. Lakin məhkəmə-tibb eksperti kimi çıxış edərək Aşıq Pəri 25 yaşında Molla Məmmədə ərə gedib, ailəli ola-ola Molla Məmməd onu zorla özünə arvad edib, sonra da bakirə çıxdığını camaata elan edib kimi yazılı mənbəyi olmayan cəfəng, elmi əsası olmayan qurama yazılarla Aşıq Pərinin həyatına müdaxilə etmək Aşıq Pəri böyüklüyünə hörmətsizlikdən başqa bir şey deyildir. Qaldı bu gün "Aşıq Pəri Mirzəcan Mədətova ərə gedib" kimi sarsaq yazılar yazan, sayıqlayan sərsəmlərə, Aşıq Pərinin Mirzəcan Mədətovun sevgisinə verdiyi iki misralıq cavabını çatdırmaq, əzbərlətmək kifayətdir:

*"Pəriyəm, mən sənə baxan deyiləm,*
*Müjqanın sinəmə taxan deyiləm!".*

Ümumiyyətlə, Aşıq Pərini, Həcəri (Həcərin Nəbinin ölümündən sonra erməniyə yox, öz həmkəndlisinə ərə getməsi söhbəti olub. Burada

qəbahətli nə var ki) erməniyə "ərə verən" qarayaxanlara bildirmək istəyirəm ki, sovet ideologiyası beynimizə beynəlmiləlçilik zəhəri doldura-nadək min illər boyu bir nəfər də olsun azərbaycanlı qızı erməni kişisinə ərə getməyib. Bəlkə sovet dönəmində barmaqla sayılacaq əks hal baş vermiş olsun. Ancaq min illər boyu şahlarımız, xanlarımız, minlərlə azərbaycanlı kişisi, adını məhəbbət qoyub dünyaya fahişəlik toxumu səpən minlərlə erməni qadını, harsın axçisi alıb, ocağı başında özünə düşmən balası bəsləyibdi. Halbuki nə xalqın yaddaşından doğan "Əsli-Kərəm" adlı məhəbbət dastanında, nə də saf sevgidən bəhs edən "Bahadır və Sona" povestində, biz nə qədər də bu əsərlərin beynəlmiləlçilik zəminində yarandığından və yazıldığından bəhs etsək də, qürur mənbəyimiz kimi qələmə versək də, nə müdrik babalarımız, nə də müdrik yazıçımız son məqamda azərbaycanlı kişisinin erməni qadınına qovuşmasına imkan verməmişdilər. Bu göstərici yenə də bizə ibrət dərsi olmamışdır. Əgər yuxarıda ünvanlarına söz dediyim sərsəmlər özlərini namus, qeyrət keşikçisi, elçisi görmək istəyirlərsə, ilk növbədə erməni qadını ilə evlənən azərbaycanlı kişiləri lənətləsinlər. Azərbaycan qadını haqqında söz deyəndə ona hörmətlə, ehtiramla yanaşsınlar. Mən bir daha təkrar edirəm ki, milli varlığımızın, dilimizin yaşaması üçün biz yalnız və yalnız Azərbaycan qadınına, onun varlığına borcluyuq!!!

**P.S.** ***Biz bu gündən səy göstərməliyik ki, Azərbaycan qadın aşıq sənətinin banisi, Cəbrayılın incisi, aşiqlər aşiqi Aşıq Pərinin 2013-cü ildə anadan olmasının 200 illiyinin dövlət səviyyəsində qeyd edilməsinə, Aşıq Pəri külliyyatının toplanıb nəfis şəkildə çap olunmasına nail olaq.***





**Dr. Fəxri VALEHOĞLU-HACILAR**

## “QAZİ QARS ŞƏHRƏNGİZİ” SİMPOZİUMU VƏ AŞIQ ŞƏRƏF TAŞLIOVA

2011-ci il oktyabr ayının son 3 gününü Türkiyənin Qars elində keçirdim. Burada təşkil olunmuş “Qazi Qars şəhrəngizi” beynəlxalq simpoziumu Türk Dünyasının dörd bir yanından görkəmli elm xadimlərini, saz-söz və ruh-əqidə adamlarını, Türkiyə Cümhuriyyətinin dövlət ərkanını bir araya gətirmişdi. Möhtəşəm qalası, zəngin tarixi mirası, planlı şəkildə salınmış düzxətli geniş küçələri üzərində inşa olunmuş Baltik memarlığı üslublu binaları ilə seçilən Qars şəhərinin hər bir səmtində bayram əhval-ruhiyyəsi hiss olunurdu. Caddə və sokakları bu mötəbər tədbiri düzənləyən qurumların loqoları əks olunmuş banerlər bəzəyirdi. Fərəhlə qeyd etmək istərdim ki, onların arasında atam Valeh Hacıların adını daşıyan elmi-mədəni araşdırmalar vəqfinin baneri də var idi. Bir sözlə, Qazi Qars həmin günlərdə Türk Dünyasının mədəni mərkəzinə çevrilmişdi.

Simpoziumu mənim üçün unudulmaz edən və dəyərini artıran əsas amillərdən biri orda tez-tez səsləndirilən Mehralı bəy və Valeh Hacılar kəlmələri, qarapapaq türklərinin tarixinə və mədəniyyətinə dair məruzələr idi. İştirakçılar arasında da qarapapaq əsilli Türkiyə vətəndaşları çox idi. “Qazi Qars şəhrəngizi” simpoziumu hərdən mənə sırf qarapapaqlara, onların dününinə və bugününə həsr olunmuş bir elmi toplantı təsirini bağışlayırdı (Qeyd edək ki, “şəhrəngiz” Türk divan ədəbiyyatında şəhərin gözəllərini və gözəlliklərini vəsf edən kiçik həcmli mənzum əsərlərə deyilir, Qazi ünvanını isə Qars tarixi mənbələrə Krım savaşı adı altında keçmiş 1853-1856-cı illər türk-rus müharibəsi zamanı qarslıların şəhəri mühasirəyə almış ruslara qarşı inanılmaz müqavimətinə və qəhrəman müdafiəsinə görə almışdı). Nəzərə alsaq ki, Qarsın demoqrafik yapısında, ədəbi mühitində və sənət aləmində həmişə qarapapaqların xüsusi çəkisi olub və xarici işğalçılara qarşı Qars və ətraf bölgələr uğrunda döyüşlərdə bu mərd türk ulusu həmişə ön sıralarda yer alıb, bu təsir təbii idi. Tədbirin qeyri-rəsmi hissəsində də qarapapaqlarla bağlı söylənənlər digər mövzuları üstələyirdi və burada Türkiyədə aşıq sənətinin zirvəsində dayanan i

qarapapaq türkü Aşıq Şərəf Taşlıovanın yüksək sənətçi-şair səviyyəsi öz sözünü deyirdi.

Simpozium axşamları hotel foyesində Aşıq Şərəfin başqanlığında adəta tədbirin ikinci hissəsi başlanılırdı. Ustadımız şirin qarapapaq ləhcəsi ilə görüb-eşitdiklərini, 2005-ci ildə haqq dünyasına qovuşmuş məşhur sənət yoldaşı və ellisi, Qarsın Qoçköy kəndində dünyaya göz açmış digər böyük qarapapaq aşığı Murad Çobanoğlu ilə bağlı xatirələrini, Ərzurumda, Vanda, Ərcişdə, Konyada apardığı saz məclislərini, dövlət xətti ilə İngiltərədə (Harvard Universitetində), Danimarkada, Qazaxıstanda, Türkmənistanda, Sinqapurda, Pakistanda və digər ölkələrdə qatıldığı tədbirləri yaddaşının süzgəcindən keçirir, arada da qarapapaq gülməcələri ilə dadlı-duzlu söhbətinə xüsusi rəng qatırdı. Ustadı dövrəyə alan bizlər isə gecə yarısına qədər onun söz sehrindən, ünsiyyət cazibəsindən ayrıla bilmirdik. Hələ Şərəf dədəni saatlarla dinləməkdən doymayan uzaq Türk ellərindən olan müsafirlərin – Dağlıq Altaydan “Altay Ruhani Mərkəzi”nin rəhbəri Akay Kınenin, N.F.Katanov adına Xakasya Dövlət Universitetinin professoru Gennadi Tündeşev-Xaramoosun, TÜRKSOY-un Başqurdustan təmsilçisi Əhəd Salihovun, TÜRKSOY-un Qazaxıstan təmsilçisi Askar Turqanbayevin, TÜRKSOY-un Qırğızıstan Dəstək Vəqfinin başqanı professor Kadirali Konkobayevin üzlərindən oxunan heyrəti ifadə etməkdə çətinlik çəkirəm. Borçalının Darvaz kəndindən olan əfsanəvi sərkərdə Mehralı bəyin 1877-1878-ci illər Türk-rus savaşında və Yəməndə göstərdiyi qəhrəmanlıqlar, Anadolunun erməni quldurlarından azad olunmasındakı xidmətləri, bu böyük qəhrəmanı ilk dəfə arxiv mənbələri əsasında araşdırıb elmi camiəyə tam cizgiləri ilə təqdim edən mərhum professor Valeh Hacılarla olan görüşlərdən anılar ustad aşığın dilindən süzülən mövzuların ana xəttini təşkil edirdi. Nəsillərinin bir tərəfdən Qazax/Salahlı, digər tərəfdənsə Borçalı/Arıxlı olduğunu söyləyib əlinə düşən ilk fürsətdəcə Borçalıya getmək və burada Mehralı bəyin yurdu Darvaza baş çəkib Valeh Hacıların qəbrini ziyarət etmək istəyini də dilə gətirdi Şərəf Taşlıova.

Simpoziumla ilgili bölüşdüyüm bu xatirələr kontekstində Aşıq Şərəf Taşlıovanın qısa tərcümeyi-halını, onun Azərbaycan kökənli tanınmış Sivaslı şair-yazar Yavuz Bülənd Bakilər və Sivaslı sənətçi-yazar Əhməd Turan Şan ilə Mehralı bəyin Sivasın Acıyurd kəndində yerləşən və hazırda dövlət tərəfindən təmir edilib ev-muzeyi kimi fəaliyyət göstərən Qonağını (malikanəsini) gəzərkən təsirlənib yazdığı “Mehralı bəy Qonağı” şeirini oxuculara təqdim etməkdən məmnunluq duyuram.



*Aşıq **Şərəf Taşlıova** 10 aprel 1938-ci ildə Qarsın Arpaçay elçəsinin qarapapaq türkləri yaşayan Gülüzü kəndində Salehgillər nəslindən Hacı bəy və Nərgiz xanımın ailəsində dünyaya gəlmişdir.*

*1954-cü ildə Çıldırda Aşıq Şenliyin oğlu Aşıq Qasımın yanında iki il çıraq durmuşdur. Sonra Aşıq Gülüstan və Aşıq Müdamidən aşıqlıq bilgiləri almışdır. 1958-1960-cı illərdə əsgəri xidmətdə olmuş, 1964-cü ildən TRT-nin Qars radiosunda əmək fəaliyyətinə başlayıb 10 il müddətində davamlı olaraq "Aşıqlarla" proqramını hazırlamışdır.*

*1967-ci ildən başlayaraq Konyada düzənlənən Türkiyə Aşıqlar Bayramına 45 il, Beynəlxalq İstanbul Festivalına 21 il aralıqsız qatılmışdır.*

*Fransa, Belçika, Hollandiya, İsveçrə, Avstriya, Danimarka, Almaniya, İngiltərə, Sinqapur, Quzey Kıbrıs, Lüksemburq, Qırğızıstan, İran və Türkmənistan kimi ölkələrə "sənət elçisi" statusunda səfərlər etmişdir.*

*Ən yaxın sənət dostu Aşıq Murad Çobanoğlu (1940-2005) olmuşdur.*

*Müxtəlif illərdə Müzik-San Vəqfi, Türkiyə Yazarlar Birliyi tərəfindən "İlin sənətçisi", Türk Dünyası Yazarlar və Sənətçilər Vəqfi tərəfindən "Türk Dünyasına hizmət ödülü" mükafatlarına layiq görülmüşdür.*

*Şərəf Taşlıova 2008-ci ildə YUNESKO-nun Yaşayan İnsan Xəzinəsinə seçilmişdir. 5 iyun 2010-ci ildə Ərdahan Universiteti tərəfindən "Yaşayan İnsan Xəzinəsi Aşıq Şərəf Taşlıova" simpoziumu təşkil edilmiş və ustad-aşığa Fəxri Xalq Ədəbiyyatı Doktoru adı verilmişdir.*

*Aşıq Şərəf Taşlıovanın Qars şəhərində heykəli ucaldılmışdır.*

*1983-cü ildə ABŞ-ın İndiana Universiteti, 1987-ci ildə Almaniyanın Berlin Universiteti tərəfindən şeirləri yazıya alınmış və üzərində incələmələr aparılmışdır. Şeirləri "Qars eli", "Türk ədəbiyyatı", "Çağrı", Milli kültür", "Türk folklor araşdırmaları", "Kök" kimi çeşidli dərgilərdə və antologiyalarda yayımlanmış, 1990-cı ildə Türkiyənin Mədəniyyət*

*Nazirliyi tərəfindən "Könül baxçası" adlı şeirlər kitabı nəşr olunmuşdur. Folklorşünas alimlər Prof.Dr. Fikrət Türkmən, Nail Tan və oğlu Dr. Mete Taşlıova tərəfindən tərtib olunan "Aşıq Şərəf Taşlıovadan toplanan xalq hekayələri" isimli kitabı 2008-ci ildə Türk Dil Qurumu tərəfindən oxucuların ixtiyarına verilmişdir. Dr. Mete Taşlıovanın "Aşıq Şərəf Taşlıova: həyatı və şeirləri" kitabı isə 2010-cu ildə Türkiyənin Milli Təhsil Nazirliyi tərəfindən çap olunmuşdur.*

*Türkiyədə və Avropada 40-a yaxın plak və səs kasseti buraxılmıdır.*

*Ş.Taşlıova 1990-cı ildən 2003-cü ilə qədər Sivas Dövlət Xalq Musiqisi Xorunun sənətçisi olmuşdur.*

*Hazırda Ankaranın Keçiörən məhəlləsində yaşayan bu dünya şöhrətli Türk-Qarapapaq aşığı pensiyaçı ömrü sürür və öz iştirakı ilə Türk Dünyası çərçivəsində keçirilən toplantı və şənlikləri şərəfləndirir.*

***ŞƏRƏF TAŞLIOVA***

## MEHRALI BƏY QONAĞI

*5 noyabr 2007-ci ildə Sivas elinin Ulaş elcəsinin Acıyurd kəndində Yavuz Bülənd Bakilər və Turan Şan ilə Mehralı bəy Qonağını gəzərkən...*

Mehralı bəy Qonağını gəzərkən,
Gözümün önündən bir aslan keçdi.
Bu duyğunu ürəyimdə süzərkən,
Tarixə şan verən bir insan keçdi.

Qars, Çıldır, Arpaçay, Tiflis, Borçalı,
Darvazdan kükrəyən Türklüyün seli,
Yüksəklərdə uçan qartal misalı,
Yenilməz, atılqan pəhləvan keçdi.

Yatdığı zindanın altını dəldi,
Xainlər içinə qorxular saldı,
Qarapapaqları yanına aldı,
Yahni təpəsindən qar-boran keçdi.

Min maşallah bu igidin şanına,
Könüllü atlılar yığdı yanına,

Qorxu düşdü düşmanların canına,
Dərə, düz demədən çox meydan keçdi.

“Mehralı bəy denən bir ətdən qala”,
Aşıq Şenlik böylə gətirdi dilə,
Bütün hər tərəfə saldı vəlvələ,
Dost sevindi, düşmanları yan keçdi.

Başında əsərdi Qafqaz rüzgarı,
Əlindən amana gəldi rus çarı,
Xatırladım Qazi Əhməd Muxtarı,
Göysündə taxılı bir nişan keçdi.

Bu gün qulağımda nal səsləri var,
İndi Acıyurdda yıl səsləri var,
Sivasda, Ulaşda yol səsləri var,
Buradan Yəmənə bir karvan keçdi.

Gördüm Acıyurdu, gördüm Ulaşı,
Mənə cənnət gəldi torpağı, daşı,
Yavuz Bülənd Bakilərin göz yaşı,
Qarabağa doğru bir ümman keçdi.

Şərəf der ki, şanlı Türkün bazarı,
Əbdülhamid Xanın sevgi nazarı,
Yəmən ellərində qaldı məzarı,
Dünyadan böylə bir qəhrəman keçdi.

**İmamverdi ƏBİLOV**
filologiya elmləri namizədi

# MİZRAB TELDƏN AYRILSA DA...



Aşıq Pənah Salyanda doğuldu, orada yaşayıb-yaratdı, Salyanda da torpağa tapşırıldı. 52 illik ömründə doğma şəhərdən ayrılmasa da, əyalət "mənəmliyindən", məhəlli məhdudiyyətdən uzaq yanar təbli sənət fədaisi kimi iqlim-iqlim tanındı, sevildi.

Təbiəti etibarı ilə əsl Azərbaycan ziyalısı olan Aşıq Pənah öz xalqına, onun keçmiş və gələcəyinə, milli ənənələrinə sadiq bir ömür sürdü – məzmun dayazlığına, bəsirətsizliyə arxa çevirən, dosta-dosta, düşmənə yad bir sənətkar ömrü! Bir həqiqəti bilirik ki, sənətkar üçün iki təhlükə mövcuddur: İstedadı olmayan peşəkarlıq və peşəkarlığı olmayan istedad! Peşəkarlığı istedadla vəhdətdə olan Aşıq Pənah aydın dərk edirdi ki, müasir zəmində yüksələn sənət iki mühüm amillə bağlıdır: Keçmişlə, gələcəklə! Bilirdi ki, keçmişi unudanların, keçmişi öyrənməyənlərin gələcəyə gedən yolu aydın deyil, dumanlıdır. Buna görə də o, folklor ədəbiyyatını, klassik aşıq poeziyasını, qəhrəmanlıq və məhəbbət dastanlarını mükəmməl mənimsəmişdi.

Məclisində iştirak edənlər Aşıq Pənahın ilhamla oxuduğu gəraylı, qoşma, təcnis, cığalı təcnis, müstəzad, qoşayarpaq, dodaqdəyməz, ustadnamə, deyişmə, müxəmməs, vücudnamə, divani... kimi sənət incilərindən zövq alırdılar. Yaddaşı bir ənənəvi xəzinə idi ki, hər məclisdə bu xəzinənin incilərindən dinləyicilərə pay düşərdi. İctimai qayğılarını, şəxsi nisgillərini, aravuran-sözgəzdirən bimürvətlərdən gileyini müstəqil, sərbəst deyə bildiyi kimi, ustad aşıqlara istinad yolu ilə də məharətlə ifadə edirdi.

Bir məclisində iştirak edirdim. Məclisdən azca əvvəl xətrinə dəymişdilər. üzə vurmasa da, qanıqara olduğunu az adam – dostları bilirdi. Qeybətçilik, ucuz sicilləmələr kimin qanını qaraltmır ki?... O ki qaldı Pənah kimi söz sərrafı ola... söhbətə musiqisiz kəlamla başladı: "Dostlar,

bu axşam saz və sözün qüdrəti ilə gecəni uzatmalı, səhəri yubatmalıyıq. Görüşünüzə dörd yüz yaşlı misralarla gəlmişəm. Gəlmişəm ki, ürfan məclisindən feyz aparaq – qeyz yox; mehr alaq – hikkə yox!...” Sonra da aşığın zil səsi sədəfli sazın harayı ilə qoşalaşdı:

*Diri dağlarından, uzaq yollardan,*
*Əlbəttə ki, bir murada gəlmişəm.*
*Eşqin sitəmindən, çərxin əlindən,*
*Bir şahım var, ona dada gəlmişəm.*

*Bülbül idim, ayrı düşdüm gülümdən,*
*Fələk vurdu, cida saldı elimdən.*
*Qurbaniyəm, Qara vəzir əlindən,*
*Şeyx oğluna şikayətə gəlmişəm.*



***Aşıq Pənah və Salyan aşıqları Moskvada Mərkəzi televiziyda çıxışdan sonra. 1971-ci il.***

400 illik yol gəlmiş Qurbani qoşması Pənahın ifasında məclisi ovsunlamışdı. Nəzərlər müstəsna aludəçiliklə aşığa dikilmişdi. Məclisə daş sükutu çökmüşdü. Kimsə dinib-danışmırdı, təkcə bir qədər əvvəl əsassız-səbəbsiz onun qəlbini qıran, istedadına açıq-saçıq darılan “dostundan” başqa. Bu kəmfürsət dost tez-tez sağa-sola dönür, yerli-yersiz suallar verir, biganəlik görəndə suallarına özü cavab verməyə də tənbəllik eləmirdi. Aşkar hiss olunurdu ki, məqsədi məclisdəkilərin diqqətini Pənahdan yayındırmaqdır. Narazı baxışlara məhəl qoymayan bu utanmaza cavab

əhli-məclisi "intizama dəvət edən" aşığın şaqraq, bir qədər də sərt avazla oxuduğu öz qoşması oldu:

*Axşam dediyini dəyişər səhər,*
*Dilində qənd olar, əlində zəhər.*
*Özü yaralayar, özü öldürər,*
*Sonra da başına döyər, utanmaz.*

Aşıq Pənah idarə etdiyi məclislərə adi şənlik yığıncağı kimi yox, ədəb-ərkan məktəbi kimi baxardı. Şübhəsiz ki, onun böyük uğurla yetkinlikdən kamillik mərtəbəsinə yüksəlməsinin başlıca səbəbi də həmin sənətkar qənaəti ilə bağlı idi. Axı, hər məclisi ədəb-ərkan məktəbinə çevirmək hər aşığa qismət olmur. Aşıq Pənahın qismətinə belə bir sənət müjdəsi düşdü. Bu da səbəbsiz deyil. Çünki o, sənət dünyamızdan, el-obanın adət-ənənələrindən bəhrələnə-bəhrələnə yaşın müdriklik məqamını vaxtından çox-çox əvvəl fəth eləmişdi.

Pənaha ümumxalq məhəbbəti danılmaz həqiqətdir. Bu məhəbbətin sirrini hərə bir cür yoza bilər. Lakin dost-həmdəm qənaəti qəti olur. Həmyaş, yurddaş, sirdaş kimi aşığa ümumel sevgisinin səbəbini onda görürəm ki, əvvəla, təbiət ona fitri səs, ilham və yaddaş bəxş eləmişdi: ikincisi, sənətini təkmilləşdirmək, cilalamaq xətrinə müstəsna səbir, dözüm, yorulmazlıq: sonra fitri sadəliklə bahəm ailəyə etibar və bağlılıqla yanaşı qohuma, dosta, tanışa gərəkli olmaq eşqi; daha sonra əsl türk kişisinə məxsus mərdanəlik, qeyrət; nəhayət, xalq qarşısında borc hissini bütün mənəvi borcların fövqündə görə bilmək məsuliyyəti... Və bir də həyat həvəsi ilə süslənmiş sadəlik, təmizlik kimi nəcib əxlaqi keyfiyyətlər töhfə vermişdi.

Müharibədən əvvəl yaradılıb hərbin ağır günlərində fəaliyyət göstərən Salyan Dövlət Dram Teatrının səhnəsinə gələndə Pənahın 18 yaşı vardı. Hər gün neçə-neçə qapını qara xəbər – "qara kağız" açırdı. Bu ağır, müsibətli günlərdə xalqı bədbinlikdən, ümidsizlikdən qorumaq – dövrün öz sənətkarına ictimai sifarişi idi. Axı, hər şey ölə bilər, ümiddən başqa! Ümid öldüsə, insan yoxdur! Salyan teatrında 18-20 yaşlı bir gəncin – Pənahın Məcnun, Kərəm, Qərib, Sərvər, Əsgər rollarında inamlı və ilhamlı çıxışları təkcə sənətin sehri deyil, xalqımızın bədbinliyə, kədərə yabançı təbiətinin təntənəsi idi. Salyanlılar kimi, qonşu rayonlular da bu gənc istedadın timsalında öz vüqar və inamlarının şahidi olurdular.

Zaman-zaman meydan genişləndi. Salyandan pərvəriş tapan sıravi səhnə həvəskarı "Saz və söz", "Məhəbbətdən danışaq", "Təzə söz, təzə mahnı", "Mənim sazım" kitablarının müəllifi Finlandiyada, Bolqarıs-

tanda, Rumıniyada, Polşada, Çexoslovakiyada, Hindistanda... öz xalqının istedad və zövqünü nümayiş etdirən məşhur aşıq, bənzərsiz sənətkar kimi tanındı, sevildi və sevildikcə ilhamlı mahnıları hisslərə, duyğulara hakim kəsildi.

Bizim Pənah doğma ocağından başqa bir əbədi vəfadar, bir əvəzsiz könüldaş tanıdı və əcəl gözlərini yumana qədər ona əbədi həmdəm oldu:

*Səndə Kərəm gözü vardır,*
*Ələsgərin izi vardır,*
*Yüz hikmətli sözü vardır,*
*Danış, telli sazım, danış.*

*Vurğun sənə vurğun oldu,*
*Hər pərdədən ilham aldı.*
*Tellərində gözü qaldı,*
*Danış, telli sazım, danış.*

*Ay ellərin səadəti,*
*Toy-düyünün şan-şöhrəti.*
*Pənahın ilk məhəbbəti,*
*Danış, telli sazım, danış.*

Müasir aşıq pürkəmal aşıqdırsa – Vətən, xalq, gözəllik aşiqidir; o hər dəfə meydanda görünəndə, mizrab telə toxunanda Qurbaninin, Abbasın, Xəstə Qasımın, Molla Cumanın, Sarı Aşığın, Ələsgərin ruhu həmin məclisdə hökmfərma olmalı, əfsanəvi zümrüd quşu kimi orada qanadlanmalıdır. Aşıq Pənah məhz bu mənada da sələf-xələf münasibətlərini ehtiramla gözləyən saz və söz xiridarı idi. O, klassiklərə borclu kimi yaşayıb-yaratdı və bu hesaba da indiki gənc aşıqlar nəslinin ustadı kimi klassiklər dünyasına qovuşdu.

Nikbin aşıq əcəlin labüdlüyünü hamı kimi bilirdi, fəqət ölümün qələbəsinə inanmırdı. Ölüm nədir ki, bütün ucalıqları məhv edə? İnsanı fiziki cəhətdən təslim edən ölüm, sənətin məhvinə hökm etməkdə acizdir. ömrün bir gün sona yetəcəyinə inanan aşıq sənətin – sənətkar dühasının ölümünə necə inana bilərdi ki, 700 yaşlı soydaş müəllimi, çağdaş ustadı Yunis Əmrə ilə hər gün həmsöhbət olur, onun müdrik kəlamını dinləyirdi:

*Sevirəm mən səni səndən içəri,*
*Yolum vardır bu ərkandan içəri.*

*Şəriət, təriqət yoldur gedənə,*
*Həqiqət meyvəsi ondan içəri.*

*Məni məndə demə, məndə deyiləm,*
*Bir mən vardır, məndə məndən içəri.*

*Süleyman quş dili bilir, dedilər,*
*Süleyman var, Süleymandan içəri.*

"Zahiri gör, batinə nüfuz elə, mənanı batində ara", – yeddi əsr yaşı olan bu vəsiyyət Pənah üçün çox müasir səslənirdi. Öz ustadlarından böyük ehtiramla öyrənən aşıq, şübhəsiz ki, buna görə də özündən içəri dünyanı məhəbbətlə vəsf edirdi. Bu, onun ilhamını qanadlandıran mənəviyyat dünyası idi, xalq mənəviyyatını yaşadan ölümsüz bir dünya... Bu dünyaya inananlar ölümün qələbəsinə inanmazlar:

*Uzaq eldən gələn qonaq,*
*El içində axtar məni...*

*Soruş məni nəğmələrdən,*
*Xəbər versin yüz zəfərdən.*
*İgidlərin dağ titrədən,*
*Nərəsində axtar məni.*

Bəlkə buna görədir ki, bu inamla yaşayanları torpağa tapşıranda "öldü" demirik, "dünyasını dəyişdi" deyirik. Aşıq Alı iki əsrdir ki, dünyasını dəyişib, bizi tərk edib, fəqət yenə də fənalıqlar görəndə, əşyapərəst-dünyagir adamlarla, acgöz qamarlayıcılarla rastlaşanda qoca aşığın öyüd-nəsihətinə ehtiyac duyuruq:

*Yığdın bu dünyanın malın, dövlətin,*
*Əllini aşırdın, yüzə nə qaldı?*
*Ayaq getdi, əl gətirdi, diş yedi,*
*Baxmaqdan savayı gözə nə qaldı?*

Çoxları kimi mən də şifahi xalq yaradıcılığının ölməz nümunələri olan məhəbbət və qəhrəmanlıq dastanlarını Pənahın ifasında vəcdlə dinləmişəm. Otuz-əllinci illərin toyları indikinə az bənzərdi – üç gün, üç gecə davam edərdi. 1950-ci ilin mayında doğma kəndim Qoltuqdakı toy

məclisində o, “Abbas və Gülgəz” dastanını elə qaynar təblə danışdı ki, kənd əhli həmin dastanı doyulmaz maraqla maqnit cazibəsinə düşənlər kimi dinlədi, hər şeyi unudub, dastandakı hadisələrin axarına düşdülər. Onda Pənah ömrünün ilk gənclik illərini yaşayırdı... 25 il sonra 1975-ci ilin meyxoş payız ərəfəsində bacım oğlu Zakirin toy məclisini idarə edəndə o, artıq sadəcə dastan söyləyən peşəkar aşıq kimi yox, həm də qoşma və ustadnamələr yaratmış yaradıcı aşıq kimi məclisi ram elədi. “Koroğlunun Bağdad səfəri”ni eşitdik – tarixi keçmişimizlə qürrələndik, bizi ömrümüzə qaytaran qoşmasını dinlədik – ilhamlandıq: “Ay mənim ana Kürüm”. Şirin söyləmələri, yaraşıqlı səsi, incə yumoru – məzahı qəlbimizi ram elədi, ruhumuzu ovundurdu:

*Pənah gah dağ olur, gah coşqun dəniz,*
*Çünki insan oğlu insanlarıq biz.*
*Torpaqdan yaranıb izsiz, kölgəsiz,*
*Torpaqda itməyin mənası nədir?*

Sənətin ümdə vəzifələrindən biri də adamları cəmiyyətə, xalqa, vətənə faydalı olmaq ruhunda tərbiyələndirmək, ömrün fəlsəfi mahiyyətini açıqlamaq, ötən günlərin ünyetməzliyini oxucuya, tamaşaçıya təlqin etməkdir. Pənahı dinləyən cavanlar ömrün gələcək illərini daha məzmunlu yaşamaq üçün daxili təpər tapar, ondan mənən müsəlləh ayrılardılar, ahıllar, qocalar isə ötən günləri xəyalən saf-çürük edər, bihudə keçən günləri təəssüflə xatırlasalar da, nisgil yükünü çiyinlərindən atardılar ki, ömrün qalan hissəsi vətəndaşlıq qüruru ilə səciyyələnsin.

Aşıq Pənah alabəzək, qurama mövzularla süni effekt yaradan, bu yolla sənətin müqəddəsliyinə xələl gətirən şöhrətpərəstliyə, ucuz şöhrətə yad idi. Başqa cür ola bilməz. Kamillik naşılığı qəbul edə bilərmi?

O, dastandan fraqment söyləyib başqa mövzuya keçməzdi, bir dastanı söyləməyə başladımı, onu axıradək, son təfərrüatına qədər danışmamış təskin olmazdı. Məhz belə məqamda tamaşaçı-dinləyici sənətin sinkretik vəhdətindən feyziyab olardı – şirin səsli Pənaha, püxtə rəqqas Pənaha, tum giləsi boyda tazanə ilə bir orkestr təsiri oyadan ifaçı Pənaha valeh olardı və istər-istəməz adama elə gələrdi ki, o, bir neçə aktyorun iştirak etdiyi meydan tamaşasına baxır. Bəli, o, sözdən və musiqidən canlı mənzərə yaratmağı bacarırdı.

İndi o, Salyanın cənub ətəyindəki qədim aramgahda uyuyur. Hər dəfə ziyarət edəndə tunca dönüb başdaşından boylanan aşığın nurlu çöhrəsinə baxıram, elə bil, kövrək, məsum, pak, doğma çöhrə dilə gəlir,

soruşur: "Necəsən dost, yaddan çıxmamışam ki?" Xəyali sorğuya xəyali cavab verirəm:

- Dalğanı dənizdən ayırmaq mümkün olsaydı, sənin kimi sənətkarı da xalqın ürəyindən qoparmaq mümkün olardı. Toylarda, dost məclislərində, ailə yığıncaqlarında, mötəbər səhnələrə xalqdan ilhamlanıb oxuduğun bayatını unutmaq mümkün olsaydı, səni də unutmaq mümkün olardı.

*Bu qala bizim qala,*
*Həmişə bizim qala.*
*Tikmədim özüm qalam,*
*Tikmişəm izim qala.*

Sən, sazın-sözün sehri ilə bir qala ucaltdın ki, ömrü əbədiyyət qədər sonsuzdur. Üstəlik, vəsiyyət elədin: "Sözlərimi saxla yadda..." İnan ki, güvəndiyin, inandığın, sevə-sevə tərənnüm edib... nisgillə ayrıldığın xalq sənin irsini öz taleyi kimi əzizləyə-əzizləyə hifz edəcək.

Deyirlər ki, axşam gündüzü tamamladığı kimi, ölüm də həyatı tamamlayır. Fiziki həyatın tamamlansa da, mizrab teldən ayrılsa da, sən öz ecazkar sənətinlə sözlərini yadda saxlayanların dostu, mehmanı kimi həmişə bizimləsən, sənət səyyahı kimi həmişə yollar müsafirisən...



Aşıq Pənah PƏNAHOV

## NƏYƏ LAZIM

Gedirəm, sevgilim, nigaran qalma,
Ayrılıq dəmində yaş nəyə lazım?!
Dərdi yük eyləyib qəlbinə salma,
Sevdalı ürəyə daş nəyə lazım?!

Ağlayıb, ağlayıb incitmə məni,
Dərd-kədər içində görməyim səni.
Yolların üstünə sər yasəməni,
Daha yolmaq üçün baş nəyə lazım?!

Pənaham, bir sənsən, bir saz – sirdaşım,
Sənət yollarında ağarır başım.
Dostlar, soruşmayın neçədir yaşım?
İlham cavandırsa – yaş nəyə lazım?!

## DOST ODUR Kİ...

Dost axtaran, dostluğun yüz şərti var,
Dost odur ki, kələk quran olmasın.
Öz yerini bir az şirin salmaqçün,
Xımır-xımır qeybət qıran olmasın.

Dost odur ki, düzə düzü düzünə,
Düz danışa, dümdüz baxa gözünə.
Düz sözünü düz də deyə üzünə,
Söz içindən söz axtaran olmasın.

Hər obada yaxşı dostun var, Pənah,
Kimdir, söylə səndən bəxtiyar, Pənah?!
Dost yolunda olsun boran, qar, Pənah,
Ancaq bircə ara vuran olmasın.

## ÜRƏYİM

Son vaxtlar baxmırsan mənim sözümə.
Aç bütün dərdimi – “soyun”, ürəyim!
Şahid tək durmusan mənim üzümə,
Gəl, açma başıma oyun, ürəyim!

Mənim aləmimdə sinədə ürək,
İnsanın qəlbilə bir vursun gərək.
Təmizsən, şəffafsan göz yaşları tək,
Yalnız saflığınla öyün, ürəyim!

Hamının dərdinə eylədim kədər,
Bəzi namərdlərçün hədərmiş, hədər.
At qəm libasını, sən də bir qədər,
Fərəhlən, ürəyim, söyün, ürəyim!

## SÖZ

Bir ürəkdən qopub gələr,
Min ürəyi dindirər söz.
Gah sinədə od yandırar,
Gah atəşi söndürər söz.

Gah könlünü alar sənin,
Gah ilantək çalar səni.
Ya hörmətdən salar səni,
Ya hörmətə mindirər söz.

Gah ağladar gülə-gülə,
Yaş tökərsən gilə-gilə.
Bağban olub çıxsa çölə,
Tikandan da gül dərər söz.

Kəlbətindir, sıxar səni,
Zor eləmə, yıxar səni.
Mənəm deyən sərkərdəni,
Öz atından endirər söz.

O qaytarar gələni də,
Naşı eylər biləni də.
Pənah deyər, öləni də,
Öz yolundan döndərər söz.

## TELLİ SAZIM

Çoxları adına köhnədir dedi,
Hər günün gərəyi, a telli sazım.
Kimi səni yerə vurmaq istədi,
Ellərin istəyi, a telli sazım.

Vicdanı, namusu əyən də oldu,
"Daloy tar", "daloy saz" deyən də oldu.
Xalqımın xətrinə dəyən də oldu,
Xalqımın ürəyi, a telli sazım.

Nakəsin, nadanın hanı axırı,
Gör necə böhtanın çıxdı paxırı.
Durma, tərif elə o nazlı yarı,
Toyların bəzəyi, a telli sazım.

Səndən ilham alıb alovlanıram,
Qoca Ələsgəri ustad sanıram.
Vurğunu, Müşfiqi bir-bir anıram,
Dahilər diləyi, a telli sazım.

Barmaqlar ötüşüb dindikcə pərdə,
Əlvida deyirik qüssəyə, dərdə.
Pənah darıxarmı sən olan yerdə,
Ömrümün çiçəyi, a telli sazım.

## GÖRƏRSƏN

Ürəyi düz, əməli düz olanı,
Sevinən görərsən, gülən görərsən.
Axtaran, öyrənən, duyan insanı,
Sirlər aləmini bilən görərsən.

Sevirəm torpağı mədh edənləri,
Əlçatmaz göyləri fəth edənləri.
Dərdini dərdində gizlədənləri –
Sevinci qardaştək bölən görərsən.

Unudub həyanı, unudub arı,
"Mənəm-mənəm!" deyib hay salanları,
Qeyrətsiz gün sürüb "ucalanları" –
Min canı olsa da, ölən görərsən.

Bülbüldən səs aldım, güllərdən nəfəs,
Pənaham, tükənməz könlümdə həvəs.
Xalqın ürəyində yaşayan ölməz –
Dünyaya təzədən gələn görərsən.

## OLMASAYDI

Dağların qüdrəti bilinərdimi,
Dərəsiz, təpəsiz düz olmasaydı.
Ürəkdən acılar silinərdimi,
Qılıncdan kəsərli söz olmasaydı.

İnsanın həyatı qəmlə dolardı,
Şəhərlər, obalar viran qalardı.
Ocaqda bayquşlar yuva salardı,
Alov olmasaydı, köz olmasaydı.

Gözəllik zirvədən yerə enərdi,
Ulduzlar qaralar, günəş sönərdi.
Qızlar bir ətirsiz gülə dönərdi,
İşvə olmasaydı, naz olmasaydı.

Nə məclis olardı, nə toy, nə büsat,
Nə gülüş olardı, nə xoş bir həyat.
Pənah da açmazdı burda qol-qanad,
Yastı balabanla saz olmasaydı.

## İNCİYƏR

Naşı bağban, girmə bağa,
Yarpaq düşər, gül inciyər.
Gəl toxunma göy budağa,
Vurma ona əl – inciyər.

Hər axşamı, səhəri sən,
Ala gözlü dilbəri sən,
Şirin sözlə dindirməsən,
Dodaq küsər, dil inciyər.

Kim zəhmətdən uzaq olsa,
Məhəbbətdən uzaq olsa,
Hər günü boş yola salsa,
Ay sevinməz, il inciyər.

Bu saf inci sözləri mən,
Toplamışam min könüldən.
Pənah ayrı düşsə eldən,
Sazındakı tel inciyər.



**Həsən MİRZƏ**
**professor**

## DƏRƏLƏYƏZDƏ

*Televiziyada ustad aşıq Qəmkeş Allahverdi haqqında gedən verilişə baxanda Dərələyəz dərdim təzələndi.*

Doğma yurdu zorla haya verdilər,
Sərraflar qalmadı Dərələyəzdə.
Aqili, şairi yurddan qovdular,
Başbilən qalmadı Dərələyəzdə,
Erməni yurd saldı Dərələyəzdə.

Folklorun Allahı sürgünə getdi,
Qəhrəman, Fətulla yurdu tərk etdi.
Cəlilin həyati qürbətdə bitdi,
Ustadlar qalmadı Dərələyəzdə.

Qəmkeş Allahverdi, Sücaət – ümman,
Ədalət Dəlidağ, Aşıq Əhliman,
Dərbədər eylədi bunları dövran,
Soyları qalmadı Dərələyəzdə.

Şahmalı Kürd oğlu – uca səs-avaz,
Xanəndə İdiris – Bayatı-şiraz.
Qəlbləri fəth edən Aybəniz, Şahnaz,
Heç biri qalmadı Dərələyəzdə.

Gülüstanın səsi qəlbi dağlayır,
Məclislərdə şöhrət coşur, çağlayır.
Cavan Mehdi yurddan dastan bağlayır,
Ünləri qalmadı Dərələyəzdə.

Vahid Əziz əziz idi elində,
Vətən sözü əzbər idi dilində.
Şeirləri mahnı, muğam dilində,
Çox heyif, qalmadı Dərələyəzdə.

Gədəbəyə köçdü Aşıq Məhəmməd,
Qərbəndi yurd seçdi Aşıq Məhəmməd.
Çoxlarına ustad oldu Məhəmməd,
Yuvası qalmadı Dərələyəzdə.

Aşıq Nabat cida düşdü yurdundan,
Yad ellərdə onu gəzdirdi zaman.
Məclislər apardı, söylədi dastan,
Bir izi qalmadı Dərələyəzdə.

Aşıq Mehdi yurda həsrətlə baxdı,
Bu dərd Ələmdarı yandırdı, yaxdı.
Həsənin beynindən ildırım çaxdı,
Qibləgah qalmadı Dərələyəzdə,
Erməni yurd saldı Dərələyəzdə.

***Bakı, yanvar 2005***

***

**Əjdər Yunus Rza**

## HAY VERƏ

***Vətən dərdli, yurd həsrətli el ağsaqqalı***
***Həsən Mirzəyə şair Əjdər Yunusun***
***şikayəti və Dərələyəz xatirələri***

Həsən Mirzə, yurdsuzluğu görməyən,
Dərdin yuyub, gündə yüz yol sərməyən,
Vətən deyib ürəyini verməyən,
Gözləmə ki, hayımıza hay verə.

Dərdimiz də dağ çəkilib, dağlanıb,
Bənd vurulub, yollarımız bağlanıb.
Nələr ötüb, nələr itib, nə qalıb?
Cavab yoxdur, suallaşdım min kərə.

Olanlara Allah da heç baxmadı,
Şər yuvasın dağıtmadı, yıxmadı.
Ərənlərdən xəbər-ətər çıxmadı,
Kim minəcək yəhərlənmiş kəhərə?

Ağladığın o dağları görmüşəm,
Əvəliyin hörüklərin hörmüşəm.
Ruhumu da dağa-daşa vermişəm,
Quru canım çıxar-çıxmaz səhərə.

Muradtəpə qardan çalma çalardı,
Əriməzdi, payızacan qalardı.
Nə şairə, nə rəssama yer vardı,
Güneyi də, quzeyi də mənzərə.

Qara bulaq diş kəsərdi içəndə,
Çox azmışam o çiskində, o çəndə.
Dərə boyu yarpızları dərəndə,
Xoş ətiri yayılardı hər yerə.

Qız-gəlinli Yastı bulaq, Təzəhli,
Gələni yox, yola baxsın ha qəmli...
Yer var idi, məncə adı Əməli,
Uşaqikən bələd idim o yerə.

Əli kişi meşəsiydi sıx meşə,
Qoyun-quzu sərilərdi Ağ döşə.
Güllüdüzdən gül dərilib həmişə,
Bir də görən, kimlər gələ, kim dərə?

Taxtalardan xırman yeri aralı,
Qızılgüldən ayrı düşən yaralı.
Ələyizdə quru ərik xaralı...
Kim açacaq, qaysavalıq pay verə?

Saymağınan nə yer bitər, nə söhbət,
Orda qaldı saf ünsiyyət, saf hörmət.
Axır, bir gün sona çatar bu möhnət,
Dağlar yenə qismət olar Əjdərə.

***29.10.2011***

*Təbrik edirik!*

**Məhərrəm QASIMLI**
**Musa NƏBİOĞLU**

# DİLİMİZİN SADİQ KEŞİKÇİSİ



***Professor İsmayıl Məmmədli: "Dilin zənginliyi xalqın müşahidə qabiliyyətinin zənginliyi deməkdir".***

Onunla tez-tez görüşürük. Azərbaycan MEA-da, müxtəlif tədbirlərdə və bir də Azərbaycan Aşıqlar Birliyində. Sonuncu ünvana tez-tezs gəlməsi də təsadüfi deyil. Axı, o, sazlı-sözlü bir aləmdə dünyaya gəlib, necə deyərlər, beşiyinin başında saz çalınıb. Babası Vəli və atası Oruc öz dövrlərinin məşhur aşıqlarından olublar. Özü də biganə deyil bu sənətə. Bir alim kimi əsas fəaliyyəti başqa istiqamətdə olsa da, xalqımızın bu ölməz sənəti ilə bağlı da tez-tez maraqlı yazılarla çıxış edir. Elə bir neçə yazısı da "Ozan dünyası"nda işıq üzü görüb. Aşıqlar Birliyi və onun orqanı olan "Ozan dünyası" jurnalı ilə müntəzəm əlaqə saxlayır, tədbirlərimizdə sadəcə iştirak etmir, həm də köməyini əsirgəmir. Sadəliyi və səmimiyyəti, yüksək ziyalı mədəniyyəti ilə seçilir. Xırda hisslərdən uzaq olub, öz ləyaqətini qorumağı bacarır. İnsanın öz ləyaqətini qorumasını həyatda başlıca şərtlərdən hesab edir və bu barədə söz düşəndə böyük şairimiz Osman Sarıvəllinin bir beytini xatırladır:

*Ləyaqətin varsa, tapallar səni,*
*Şan-şöhrət dalınca qaçmaq əbəsdir!*

Olduqca zəhmətkeş, özünün və başqasının vaxtını qiymətləndirməyi bacaran, vaxtdan səmərəli istifadə edən insandır. Onun zəhmətə bağlılığından söz açanda istər-istəməz A.V.Lunaçarskinin belə bir fikri yada düşür: "Qiymətli vaxtını öldürən adam özünü öldürür, öz insanlıq ləyaqətini öldürür, insanlıq idealını öldürür". Onun barəsində düşünərkən bir

də alman filosoflarından birinin dediklərini xatırlamaq yerinə düşər: "Böyük zəkalar bəşəriyyətə nə verməlidirlərsə, onlar onu artıq gənclikdən toplamağa başlayırlar".

Bir alim kimi çox uğurlara imza atsa da, heç vaxt özündən deməyi sevməz, yersiz iddialardan, təkəbbürdən çox-çox uzaqdır. Və hesab edirik ki, bizim bu yazımıza da onun ehiyacı yoxdur. Çünki yaşadığı mənalı alim ömrü ilə neçə-neçə belə yazıdan üstündədir. Onun xasiyyətinə bələd olduğumuzdan bəlkə heç biz də bu yazını ilin-günün bu vaxtında yazmayacaqdıq sadəcə bir təsadüf olmasaydı. Sən demə az qala hər gün görüşdüyümüz alim qardaşımızın bu ilin noyabr ayında 65 yaşı tamam olub. Elə bu səbəbdən də dost ərməğanı kimi bu yazını qələmə aldıq.

...İsmayıl Oruc oğlu Məmmədli 1946-cı il noyabrın 15-də Göyçə mahalında ustad aşıq Orucun ailəsində dünyaya gəlib. 1962-1967-ci illərdə Azərbaycan Pedaqoji Dillər İnstitutunun alman-Azərbaycan dilləri şöbəsində təhsil alıb, 1967-1970-ci illərdə Azərbaycan Sovet Ensiklopediyası baş redaksiyasında elmi və ədəbi nəzarət redaksiyasında əvvəlcə redaktor, sonra böyük elmi redaktor vəzifələrində çalışıb. 1970-1973-cü illərdə Azərbaycan EA Nəsimi adına Dilçilik İnstitutunun əyani aspiranturasında oxuyub. 1974-cü ildə namizədlik, 1993-cü ildə doktorluq dissertasiyası müdafiə edib.

İ.Məmmədli 1989-cu ildən AMEA-nın Dilçilik İnstitutunda lüğətçilik şöbəsinə rəhbərlik edir. "Ekran, efir və dilimiz" monoqrafiyası, "Azərbaycanca-rusca etnoqrafiya terminləri lüğəti", üçcildlik "Azərbaycan dilinin izahlı lüğəti" (tərtibçilərdən biri), "Azərbaycanca-rusca danışıq kitabı" (həmmüəllif), "Vurğu lüğəti" (tərtibçi və redaktoru), "Azərbaycan dilinin orfoqrafiya lüğəti" (təkmilləşdirilmiş, artırılmış sonuncu mükəmməl nəşrin (2004) tərtibçisi), "Neft və qaz sənayesinə aid terminlərin lüğəti"nin (ingilis, Azərbaycan və rus dillərində) redaktoru, "Axtarışlar, yozumlar, anımlar", "Qəzet dilinin leksikası" və s. kitabların müəllifidir. Eyni zamanda monoqrafiya və lüğətlər nəşr etdirmişdir.

Çoxşaxəli və çoxsahəli yaradıcılığa malik olan İsmayıl müəllimin əsas araşdırmaları Azərbaycan dilçiliyinin leksikologiya, onomalogiya, etnolinqvistika, lüğətçilik, şifahi nitq, üslubiyyat, nitq mədəniyyəti və digər sahələrə aiddir. İndiyədək onun 200-ə qədər elmi əsəri, resenziya və publisistik yazıları dərc olunub. Uzun illər Azərbaycan televiziyasında "Azərbaycan dili" verilişinin aparıcısı olub.

Professor İ.Məmmədov 2002-ci ildən Azərbaycan Respublikası Ədliyyə Nazirliyinin Qanunvericilik və hüquqi təbliğat idarəsində məsləhətçi-filoloq vəzifəsində də çalışır. Azərbaycan Respublikası yanında Dövlət Dil Komissiyasının üzvüdür. Azərbaycan Yazıçılar və Jurnalistlər

birliklərinin, dilçilik üzrə doktorluq müdafiə şurasının və bir çox nəşrlərin redaksiya heyətlərinin üzvüdür. Azərbaycan jurnalistlər birliyinin H.Zərdabi adına mükafatına layiq görülüb.

Dilçiliyin inkişafında böyük xidmətləri olan İsmayıl müəllim deyir ki, dil milli mənəvi sərvətimiz, milləti tanıdan əsas keyfiyyət, güvənc yerimiz, millət kimi tanınma nişanımızdır: "Dilimizin qüdrəti çox böyükdür. Bu, xüsusən şifahi xalq ədəbiyyatında zəngin ifadəsini tapıb. Zəngin xalqların həm təfəkkürü, həm də ki, şifahi ədəbiyyatı zəngin olur. Xalqımızın folkloru hədsiz zəngindir. Hələ bundan sonra çap ediləsi cild-cild dastanlarımız, nağıllarımız, bayatılarımız var."

Dil təfəkkürlə bağlı olan məsələdir. Təfəkkürü zəngin olan xalqın dili də zəngin olur. Bu barədə danışanda İsmayıl müəllim belə deyir: "Dilimizin zənginliyi hər şeydən əvvəl türklərin dünyagörüşünün zənginliyi ilə bağlıdır. Dilin zənginliyi xalqın müşahidə qabiliyyətinin zənginliyi deməkdir".

Dilin normalarının pozulmasına, yerli-yersiz yabançı sözlərdən istifadə olunmasına qarşı son dərəcə barışmazdır: "Dilin norması pozulsa, dilə qarşı açıq, ya gizli hücum olsa, əsl alim ona biganə qala bilməz. Bəziləri dilimizdə  yeri gəldi-gəlmədi ərəb, fars və Avropa xalqlarının dillərindən sözlər işlədirlər. Nəticədə həftəbecər bir şey alınır. Gərək hər kəs öz milli mənliyinə hörmətlə yanaşsın. Mənliyini dərk etməyən adamdan dilə hörmətlə yanaşmağı tələb etməyin özü mənasızdır".

Bir alim kimi əsas fəaliyyəti lüğətçiliklə bağlı olan, lüğət tərtib etməyi olduqca əzablı iş sayan İsmayıl müəllim bu sahənin spesifik xüsusiyyətlərindən danışarkən deyir: "Lüğət hazırlamaq olduqca çətin işdir. Hər kəs bu işi bacara bilməz. Bu işlə məşğul olmaq yüksək səbir və hövsələ tələb edir".

İsmayıl müəllimin haqqında çox danışmaq, çox yazmaq olar. Amma barəsində ən yaxşı yazını – ömür kitabını özü yazır. Elmdə qazandığı uğurları və cəmiyyətdəki ziyalı mövqeyi ilə hər gün bu kitaba yeni-yeni parlaq səhifələr əlavə edir. Alim dostumuzu anadan olmasının 65 illik yubileyi münasibəti ilə təbrik, ona yeni-yeni uğurlar arzulayırıq.



**Seyfəddin QƏNİYEV**
**filologiya elmləri doktoru, professor**



# AŞIQ MƏMMƏDAĞANIN POEZİYA DÜNYASI

XX əsrin 50-ci illərindən sonra Şirvan aşıq mühitinin inkişafı, təbliği və genişlənməsində bir çox görkəmli sənətkarlar – Aşıq Qurbanxan, Aşıq Abbas, Aşıq Bəylər, Aşıq Əhməd, Aşıq Şakir, Aşıq Şamil, Aşıq Barat, Aşıq Pənah, Aşıq Xanmusa, Aşıq Xanış və Aşıq Şərbətlə yanaşı Aşıq Məmmədağanın da xüsusi xidmətləri olmuşdur.

Aşıq Məmmədağa Ağaxan oğlu Babayev 1930-cu ildə Şamaxının saz-söz ocaqlarından biri sayılan Cəyirli kəndində dünyaya göz açıb. Bir müddət sonra ailəsi Şamaxı şəhərinə köçdüyündən Məmmədağa orta təhsilini burada alıb.

Gənc yaşlarından aşıq yaradıcılığına rəğbət bəsləyən Məmmədağa bu ulu sənətin sirlərini Şirvan aşıq mühitinin dədə sənətkarı sayılan ustad Aşıq Mirzə Bilalın şagirdi Aşıq Abbasdan alaraq müqtədir aşıq səviyyəsinə yüksələ bilib. Ötən əsrin 50-ci illərinin sonunda sərbəst fəaliyyətə başlayan sənətkar tez bir zamanda təkcə Şirvan mahalında deyil, Azərbaycanın bir çox bölgələrində, eləcə də Dağıstanda və Gürcüstanda da sevilib, məclislərə dəvət olunub. Ötən əsrin 70-ci illərindən sonra keçmiş sovetlər birliyinin bir çox guşələrində – Moskva və Leninqrad şəhərlərində, Orta Asiya respublikalarında keçirilən festival və müxtəlif səpgili tədbirlərə qatılaraq doğma Azərbaycana medal və fəxri fərmanlarla dönüb.

M.Babayev yaradıcı sənətkar olub, aşıq şeirinin demək olar ki, bütün şəkillərində qələmini sınayaraq sanballı əsərlər yaradıb. Onun şeirləri vaxtı ilə bir çox jurnal və qəzet səhifələrində, toplularda və ayrıca kitab kimi işıq üzü görüb.

Hər bir sənətkarın yaradıcılığı, əslində, onun özüdür. Sənətkar bədii əsər yaradarkən nəyi və necə yaratmasından asılı olmayaraq, mətndə özünü gerçəkləşdirir. Əsərdəki bütün ruhi-mənəvi yaşantılar, əslində,

müəllif «mən»inin psixoloji təcrübəsidir. Ona görə də Aşıq Məmmədağa dünyasına gedən yol bütün hallarda onun şeirlərindən keçir. Bu şeirlər bizim dünyamızla indi artıq bu dünyada olmayan sənətkarın arasında qalan yeganə körpüdür. Necə deyərlər: «Özü gedib, sözü qalıb». Və bu söz Məmmədağa dünyasının yeganə bələdçisidir. Məmmədağanın şeir-fikir dünyasına nüfuz etmək üçün bizə onun «söz»ündən başqa heç nə etibarla bələdçilik edə bilməz...

Məmmədağa sözə və sənətə həsr olunmuş ömür yaşadı. Omrün ona əmanət verildiyini, bir gün haqq-hesab sorulacağını bir an belə unutmadı. Ona görə də vaxtaşırı özünə hesabat verdi:

*Ürəyindən nur almasa hünərin,*
*Gur səsini bu aləmə yay görüm,*
*Ömür gəlib başa çatdı deyəndə,*
*Nə götürüb qoyduğunu say görüm.*

Məmmədağa ömrünü maddi qazanc – var-dövlət naminə yaşamadı. Dəyəri dəyərdən seçdi, şirini acıdan, yaxşını pisdən, azı çoxdan, qədirbiləni qədirbilməzdən, halalı haramdan, mərdi namərddən, özünün dediyi kimi, «buğdanı darıdan» fərqləndirdi. Hərəsinin öz qiymətini verdi. Çünki Yaradan nəyi yaradıbsa, ona məna verib. İnsanın hünəri dəyərlərin qiymətini bilməkdə, sənətkarın hünəri dəyərləri sözün mənasına çevirib xalqa çatdırmağı bacarmaqdadır:

*Hesablama qazancını, varını,*
*Buğda yeyən saya salmaz darını,*
*Qəlb göynətsə pis övladın halını,*
*Tut özünü xoşbəxtlərə tay, görüm.*

Aşıq Məmmədağa dünyasının çıxış nöqtəsi eşqdir. Bu eşqi heç bir halda həmin anlayışın fiziki-cismani mənasında qavramaq olmaz. Şirvanda eşq bütün hallarda ilahi çalar və boya daşıyır. Sənət aləminə Şirvanda qədəm qoymaq, sənətkar kimi Şirvanda pərvəriş tapmaq təsəvvüfi-irfani eşq məktəbini keçib, ilahi aşiqlik bulağından su içmək deməkdir. Bu, həm hərfi, həm də məcazi mənada belədir. Yəni Şirvanda təsəvvüfi eşq aşıq sənətinin mahiyyətində, canında, ruhundadır. Şirvan aşıq məktəbinin əsasında xalq yaradıcılığının əskilərdən gələn zəngin ehtiyatları dayanır. XV-XVI yüzillərdən başlayaraq xalq musiqisi və söz sənəti sufi praktikanın aktiv dövriyyəsinə daxil olur və Azərbaycan sufizmini forma baxımından fərqləndirən əsas göstəricilərdən birinə çevrilir. Təsəvvüf ruh fəlsəfəsidir, ruhla davranış üçün konkret etnik arealın ruhuna uyğun vasitələr istifadə olunmalıydı. Türk ruhu Türk musiqisinin və Türk şeirinin ritminə, melodiyasına, tempinə və tembrinə köklən-



diyindən ruhun yüksəlməsi vasitəsilə Tanrıya yaxınlaşmağa, mənəvi kamilliyə və saflığa yetişməyə ruhun daşındığı xalq yaradıcılığı ehtiyatları ilə nail olmaq olur. Əslində, Azərbaycan aşığı təsəvvüflə folklorun qovşağında, təmas nöqtəsində yaranır və orta çağ mədəniyyətinin keyfiyyətcə yeni bir vahidini təşkil edir. Şirvanda sufi poeizyasının, o cümlədən sufi ocaqların zənginliyi bu folklor mühitinə böyük təsir göstərmişdir. Onların arasında biri digərini zənginləşdirən çoxşaxəli əlaqələr və qarşılıqlı təsirlər mövcud olmuşdur.

Bu cəhətdən Aşıq Məmmədağanın eşq və aşiqlik yolunu, sevgi poeziyasını Dostu Şirvani, Aşıq İsmi, Aşıq Hacı, Aşıq Nurəddin, Aşıq Mirzə Bilal, Aşıq Şamil, Aşıq Abbas, Aşıq Ağalar, Aşıq Şakir, Aşıq Əhməd kimi Dədə sənətkarların keçdiyi böyük və zəngin **«Eşq və Aşiqlik»** məktəbindən qıraqda təsəvvür etmək olmaz. Bu məktəb ruhani yoldur. Həmin ruhun daşıyıcıları öz varlıqlarında eşq və aşiqlik odunu gəzdirirlər. Əslində, Şirvan aşığının varlığında nə varsa ilahi eşq və aşiqlik ruhu ilə yoğrulmuşdur. Şirvan aşıqlığının yolunu tutanlar istəsələr də, istəməsələr də eşqin ilahi məktəbini keçməli idilər. Çünki bu məktəb artıq poetik ənənədə, şeirin məzmun və forma aləmində, metaforik sistemində, sənətin bütün quruluş və detallarında yaşayırdı. Burada artıq mürşid-mürid münasibətlərinə ehtiyac yox idi. Bir də ki, ta Pir Hüseyndən, hürufi Nəsimidən, Seyid Yəhya Bakuvidən, Şeyx Eyyubdan, Siracəddin Əfəndidən baş alan müqəddəs yol ilə mürşid də, mürid də Şırıvan aşıq ənənəsinin ruhuna qovuşmuşdu. Şirvan aşıqlığının yolunu tutan Aşıq Məmmədağa da ilahi eşq ənənəsinin bulağından su içib kamala çatıb. Buna ən böyük və etibarlı şəhadəti onun poeziyası verir...

Aşıq Məmmədağanın eşqində məkanla zaman, insanla təbiət iç-içə, boy-boyadır. Bunları biri-birindən əsla ayırmaq mümkün deyildir. Çünki Ulu Yaradan varlıq aləminin bütün ünsürlərini – insanı, dünyanı, təbiəti, cəmiyyəti və s. vəhdət içində yaradıb. Sadəcə, bu vəhdətə nə dərəcədə yaxın olmaq məsələsi var. Məmmədağa varlıq aləminin vəhdətini içində gəzdirən sənətkar olub. Ona görə də biz aşığın lirikasına diqqətlə yanaşdıqda istər-istəməz onun poeziyasında təbiətə vurğunluğun ilahi səviyyəsi ilə qarşılaşırıq. Bizcə, bunun bir səbəbi də boya-başa çatdığı

Şamaxının füsunkar təbiəti və bu regionda mövcud olan ziyarətgahların Məmmədağanın qəlbini cavanlıqdan özünə məftun etməsi, bağlaması, ovsunlaması olub.

Bir sözlə, vətənin gözəllikləri ömrü boyu heyrətə salıb Məmmədağanı. Bu heyrət onun poeziyasında ilahi notlarla şifrələnmiş eşqin ilkin mərhələsidir. Əslində, aşiqlik heyrətdən başlanır. Aşiq olmağın, eşqə düşməyin birinci pilləsi (şərti) varlığın gözəlliyindən heyrətə gəlməkdir. Bu varlıq İlahinin verdiyi hər bir şəkildə ola bilər: insan şəklində də, ceyran şəklində də, dağ, çəmən, çöl, çiçək şəklində də... Bu mənada, eşqə düşən Uca Allahın yaratdığı gerçəklikdə təzahür – təcəlla edən ilahi gözəlliyə aşiq olur. Aşiqliyin isə müxtəlif səviyyələri var. Kimi elə bütün ömrü boyu insan gözəlliyinin aşiqi olaraq qalır. Kimisi insana biganə olub, təbiətin, lal suların, yaşıl ağacların, füsunkar çiçəklərin gözəlliyinin əsiri olur. Məmmədağa gerçəkliyin həqiqi və kamil aşiqi idi. Onun üçün insanın gözəlliyi ilə təbiətin gözəlliyi arasında fərq yox idi. Çünki hər iki gözəllik bir bulaqdan – Hüsni-Mütləqdən başlanıb yenə də bir məqamda qovuşurdu. Bu cəhətdən Məmmədağanın təbiət gözəlliklərini vəsf edən şeirləri də dərin fəlsəfi məna qatlarına malikdir.

Aşıq Məmmədağanın təbiət eşqi bütövdür: o, təbiəti olduğu kimi sevir. Şirvan mahalını başdan-başa gəzib-dolanan, allı-güllü yaylaqları, başıqarlı uca dağları, geniş ormanları gəzməkdən, seyr etməkdən doymayan aşıq ürəyindən keçənləri sözün dili ilə bəyan edir. Hiss-həyəcanı, sevgisini məclislərdə məlahətli səsi ilə el-obaya çatdırır. «Dağların» qoşması fikrimizə dəstək verir:

*Kəklik yaylağıdır, qartal yuvası,*
*Qılınc qaşı, haça beli dağların.*
*Haray salır dərələrə, düzlərə,*
*Axar boz-bulanıq seli dağların.*

*Görmüşəm qışını, baharını mən,*
*Dadmışam hər fəslin nübarını mən,*
*Sevmişəm şahanə vüqarını mən,*
*Mərd olur obası, eli dağların.*

*Qəddi əyilməmiş hələ yaşından,*
*Mərd çıxıb zamanın hər savaşından,*
*Çiçəkli yazından, qarlı qışından,*
*Al-yaşıl bəzənər ili dağların.*

Aşığın "Dağların" rədfli qoşması "dəryadan götürülmüş damla misallıdır. Damla heç vaxt dəryanın suyunun əzəmətini, dalğalarının gücünü özündə əks etdirməz, ancaq dadını, cismani mahiyyətini ortaya qoya

bilir. Məmmədağanın bu şeiri də dəryadakı damla kimi onun təbiət fəlsəfəsinin cövhərini başa düşməyə imkan verir. Şeiri misra-misra, bənd-bənd, məna-məna təhlil etsək, çox maraqlı elmi mənzərə alınar:

1. Məmmədağa təbiəti hər üzü ilə sevir. Yaxşı ilə pisin, gözəlliklə çirkinlyin biri-birinə bağlı olduğunu dərindən anlayır. Kimisi dağların yaşıllığından, quşlarının cəh-cəhindən, min bir dərdə dərman olan otlarının ətrindən cuşə gəlirsə, dağın insanları qorxuya salan, qəlblərinə vahimə çökdürən selini də sevir Aşıq Məmmədağa...

2. Sənətkar üçün təbiət – dağ bütün üzü ilə gözəldir. Yaradan varlığı xəlq edərkən onu hər üzü ilə gözəl və faydalı yaradıb. İnsanlar dağların baharını sevir, qışından həzər edirlər. Lakin Məmmədağa insanları dağların baharı – istisi, hərarəti, yaşıllığı, gülü-çiçəyi ilə bərabər, qışını – soyuğunu, qarını, tufan-boranını da sevməyə çağırır.

3. Müəllif təbiətinin gözəlliyini təkcə gözləri ilə görüb cismi ilə hiss etmir; onu bütün varlığı ilə içərisindən keçirir. Bir sözlə, dağın varlığını – öz varlığında, öz varlığını – dağın varlığında tapır ustad Məmmədağa. Məmmədağanın «Görmüşəm qışını, baharını mən // Dadmışam hər fəslin nübarını mən» misralarının mənası da, məğzi də məhz budur...

Aşıq Məmmədağanın yaradıcılığında «ana yurd» obrazı qat-qat quruluşa malik olan mürəkkəb hadisədir. Burada sənətkarın anadan olduğu səfalı Cəyirli kəndi, gözünü açıb ilk dəfə gördüyü Qarpızlı dağı, Turunc bulağı, ormanlar, dərələr, düzlər, bütün bunların yerləşdiyi Şamaxı rayonu, Şirvan bölgəsi və s. əsasdır. Bu, təkcə Məmmədağa ilə bağlı yox, bütün sənətkarlarla bağlı hadisə olub, öz əsaslarına malikdir.

Əvvəldə qeyd etdiyimiz kimi, Aşıq Məmmədağanın vətən anlayışının ilkin pilləsi – dünyanı göz açıb ilk dəfə gördüyü kəndi, onun zirvəsi – Azərbaycandır. Şirvanda dünyaya gəlib sonralar Azərbaycanı qarış-qarış gəzdikcə əsl vətən aşiqinə çevrilən Aşıq Məmmədağanın yaratdığı vətən – yurd obrazı şəkilcə də rəngarəngdir. Bu da səbəbsiz deyil. Prof. A.Hacılı yazır ki, Azərbaycan türklərinin etnik-coğrafi təsəvvürlərinin tədqiqinin müəyyən özünəməxsusluqları var. Belə ki, yurdumuzun ərazisi bir çox digər tarixi-etnik məkanlardan fərqli olaraq, daxilən olduqca rəngarəngdir; dağlar, dərələr, düzənlər, meşələr, ormanlar, qummluqlar, dənizlər, çaylar zəngin bir mənzərə yaradır. Məhz buna görə azərbaycanlıların həyatında köçəri, oturaq, dağlı həyatı keçirən xalqlara xas özəlliklər qovuşur. Və milli mədəniyyətimiz yurdun coğrafi əlvanlağından gələn, şüurumuzun kökündə, substrat mahiyyətində izlənən polietnoqrafiklik qazanır.

Belləkliə, Şamaxı sadəcə vətən deyil, fəxr etdiyi, ləyaqət və şərəf gücü aldığı müqəddəs məkandır. Aşıq Məmmədağa üçün... O, «Şamaxı» rədifli şeirində öz istəyini belə ifadə edir:

*Tarixdən, taledən soruşuram mən,*
*Kimin idi, kimə qaldı Şamaxı?*
*Çıxdı neçə-neçə qanlı döyüşdən,*
*Neçə yol qələbə çaldı Şamaxı.*

Bu qoşmada Şamaxının tarixi-mədəni obrazını yaratmışdır ustad sənətkar. Bu obrazın cizgilərinə diqqət etdikdə, biz Aşıq Məmmədağanın vətənin bir parçası olan Şamaxını bir vətən övladı kimi necə dərk etdiyini öyrənirik...

Aşıq Məmmədağanın yaradıcılığı üçün xarakterik olan motivlərdən biri mənəvi-əxlaqi dəyərlərin tərənnümü, xeyirin, haqqa, ədalətə xidmət edən dəyərin təsdiqi, şərin isə inkarıdır. Sənətkar bu məsələdə milli ənənələrdən çıxış etmişdir. Yəni o, istər bir insan, istərsə də bir aşıq kimi bütün hallarda ənənənin varisidir. Bu ənənə isə xeyir-şər modeli üzərində qurulmuşdur.

Sənətkara görə, insanın xisləti dünyanın ilahi quruluşunu özündə əks etdirir. Uca Allah varlıq aləmini xeyirin və şərin, yaxşılığın və pisliyin vəhdətində qurmuş, xeyiri və yaxşılığı uca əməl kimi yaratmışdır. Aşıq bir çox şeirləri ilə yanaşı istəkli dayısı Əlisəfa kişiyə ithaf etdiyi «Əyilməz namərdə, yada yaxşılar» şeirində deyir:

*İnsan xislətində əzəl binadan,*
*Ucada dayandı, durdu yaxşılar.*
*Haqqın dərgahında hər bir əməldə,*
*Zülmətdə yamanlar, nurda yaxşılar.*

Göründüyü kimi, şeirdə yaxşı-pis, mərd-namərd qarşıdurması əsasdır. Təhlil sənətkarın yaxşı insan modelinin əsas kefiyyətlərini görməyə imkan verir...

Məmmədağanın poeziyasında dərin məzmunlu ustadnamələr vardır. Onlarda ustadnamə şeirinin poetikası bütün özünəməxsusluğu ilə əks olunmuşdur. Aşıq Məmmədağa öz həyat təcrübəsini məhz ustadnamə şeirinin poetik çərçivəsində bəyan etməyi münasib hesab etmişdir. Bunun səbəbi ustadnamə şeirinin janr özünəməxsusluğuna bağlanır. Mərhum professor Ə.Mirəhmədov göstərirdi ki, ustadnamə «ustad sözü», «ustad öyüdü» deməkdir...

Bütün bu deyilənlər bizə belə bir qənaətə gəlməyə imkan verir ki, həyatının və yaradıcılığının çiçəkləndiyi bir vaxtda - 1977-ci ildə dünyasını dəyişib böyük M.Ə.Sabirin uyuduğu "Yeddi Günbəz" qəbirstanlığında dəfn olunan Aşıq Məmmədağa XX əsr Şirvan aşıq mühitinin ünlü sənətkarı kimi, müasir Azərbaycan aşıq poeziyasının inkişafında görkəmli rol oynamış sənətkarlardandır.

## AŞIQ ƏHMƏD RÜSTƏMOV - 90

# USTAD AŞIĞIN YUBİLEYİ QEYD OLUNMUŞDUR



Mə də niyyə t

2011-ci il dekabrın 1-də Kürdəmir rayon Mədəniyyət evində Azərbaycan aşıq poeziyasının görkəmli nümayəndəsi aşıq Əhməd Rüstəmovun 90 illiyinə həsr olunmuş yubiley tədbiri keçirilmişdir. Tədbirin iştirakçıları əvvəlcə Kürdəmirdəki Fəxri xiyabana getmiş, ustad sənətkarın qəbrini ziyarət etmiş, məzarı üstünə çiçəklər qoymuşlar. İştirakçılar rayon Mədəniyyət evinin foyesində sənətkarın həyat və fəaliyyətini əks etdirən sərgiyə baxmışlar.

Tədbirdə rayon icra hakimiyyətinin başçısı Fəxrəddin Məlikov, professor Seyfəddin Qəniyev, AMEA-nın Folklor İnstitutunun aşıq şöbəsinin müdiri Elxan Məmmədov, filologiya elmləri namizədi Yaqut Bahadurqızı, aşıq Əhliman və başqaları çıxış etmiş, ustad sənətkarın həyat və yaradıcılığı barədə danışmışlar. Qeyd olunmuşdur ki, aşıq Əhməd 1921-ci ildə Kürdəmir rayonunun Carlı kəndində bəy ailəsində anadan olmuşdur. İlk sənət dərslərini həmkəndlisi aşıq Əlidən almışdır. Aşıq Əhməd 1941-1945-ci illər müharibəsinin iştirakçısı olmuş, bir çox döyüş orden və medalları ilə təltif edilmişdir. Yaralandıqdan sonra cəbhədən geri qayıdan aşıq öz həyat yolunu rayon mədəniyyət evi ilə bağlamış, ömrünün sonunadək burada çalışmışdır. Bütün həyatını əlində

saz, sinəsində söz çeşməsi gəzdirərək Azərbaycan mədəniyyətinə şərəflə xidmət etmişdir.

Aşığın "Sazımın telləri" (1965), "Əlləriniz yorulmasın" (1980), "İtən sazım" (1995), "Xoş gəlmisən Kürdəmirə, rəhbərim" (1998), "Dastanlar" (2004) kitabları geniş oxucu kütləsinin marağına səbəb olmuşdur. 20 dastanın yaradıcısı olan sənətkarın 6 dastanı nəşr olunmuşdur. Aşıq Əhməd dövrünün yaradıcı adamları ilə daim ünsiyyətdə olmuş, onlarla dostluq etmişdir. O, xatirələrində aşıq Şəmşiri, Səməd Vurğunu, Bülbülü, sənət dostları aşıq Şakir Hacıyevi, Eynulla Cəbrayılovu, dünya şöhrətli balabançı Həsrət Hüseynovu böyük hörmətlə yad edirdi.

1978-ci il fevralın 11-də A.M. Şərifzadə adına Aktyor Evində aşıq Əhmədin yaradıcılıq gecəsi keçirilmişdir. Onun 80 illik yubileyi Bakıda "Vahid" poeziya evində təntənəli şəkildə qeyd edilmişdir. Aşıq Əhmədin yaradıcılığı dövlət tərəfindən yüksək qiymətləndirilmiş, 1989-cu ildə ona "Əməkdar mədəniyyət işçisi" fəxri adı verilmişdir.

Aşıq Əhməd ulu öndər Heydər Əliyev siyasətinin alovlu təbliğatçısı olmuş, ümummilli liderin Kürdəmirə tarixi səfərləri zamanı onunla dəfələrlə görüşmüşdür. Bütün mənalı həyatı boyu dövlətçiliyə sədaqətlə xidmət edən sənətkar ulu öndərə, Vətənə, torpağa sevgisini poetik fikirlərlə ifadə etmişdir. O, Yeni Azərbaycan Partiyasının üzvü olmuşdur. Aşıq Əhməd Rüstəmov Azərbaycan Aşıqlar Birliyinin və Yazıçılar Birliyinin üzvü olmuş, respublika aşıqlarının III və IV qurultaylarına nümayəndə seçilmişdir.

Saz, söz sənətinin incəliklərini yorulmadan gənc nəslə öyrədən ustad sənətkarın şagirdləri aşıq Əhliman, aşıq Məhəmməd, aşıq Habil, aşıq Qəlbinur və başqaları Əhməd bulağından bəhrələndiklərini bu gün fəxrlə söyləyirlər.

Aşıq Əhməd Rüstəmov 2008-ci il avqustun 12-də vəfat edib. Ölümündən sonra rayon icra hakimiyyəti başçısının sərəncamı ilə yaşadığı küçəyə onun adı verilib. Hazırda aşığın şəxsi arxivi və əşyaları rayon tarixdiyarşünaslıq muzeyində saxlanılır.

**Aşıq Əhməd RÜSTƏMOV**

## YURDUMUN

Aşıq, gəl sinəmi aç varaq-varaq,
Məndədir söhbəti, sözü yurdumun.
Ellər başdan-başa olub çil-çıraq,
Gülür mənim kimi üzü yurdumun.

Könül həmdəmimdir, ürək sirdaşım,
Müqəddəs anamdır, əkiz qardaşım.
Hüsnünə saz tutub, bir şeir qoşum,
Bu geniş dünyanın gözü yurdumun.

Al-yaşıl dağları el yaylağıdır,
Gözəllər məskəni Kür qırağıdır.
Dostu sevindirən bağça-bağıdır,
Yandırır düşməni gözü yurdumun.

Əhməd, gör nələr var Muğanda, Mildə,
Gül açıb bar verir körpə şitil də.
Gözəl bayramlarda, hər təzə ildə,
Dil açır sinəmdə sazı yurdumun.

## BİR SALAM VERƏK

Dil aç, telli sazım, Şirvan elindən,
Gəl gedək Qazağa bir salam verək!
Vaqiflə bir yerdə Cıdır düzündən,
Gözəl Qarabağa bir salam verək!

Göyəzən dağının gəzək zirvəsin,
Pambıqlı çöllərin çarpaz cərgəsin.
Açaq söz mətahın, şeir süfrəsin,
Hər elə, oymağa bir salam verək!

Ötək pərdə-pərdə, verək səs-səsə,
Ürək şad olarmı deyib gülməsə.
Vurğun gəzən yeri bizə kim desə,
Əhməd, o torpağa bir salam verək!

## OLMASIN

Mən istərəm yer üzündə əzəldən,
Şənlik olsun, ah-fəğan olmasın.
Könül ilham alsın sevən gözəldən,
Vüsal olsun, amma hicran olmasın.

Nə qəzəb yaşasın ürəkdə, nə kin,
Düz yola meyl elə, şər işdən çəkin.
Haqqı nahaq edən, gözəli çirkin,
Zəlalət, məşəqqət, böhran olmasın.

Gör nə gözəl el bəslədi Əhmədi!
Bülbül ilə gül bəslədi Əhmədi!
Saz çağırdı, tel səslədi Əhmədi,
Könlüm niyə bəs çıraqban olmasın?

## OLMASA

Həvəsə, ilhama gələ bilmərəm,
Gülşənim olmasa, gülüm olmasa.
Yetişməz ellərə səsim, sorağım,
Kamanım olmasa, telim olmasa.

Olmasa aşığın şirin söhbəti,
Qazanmaz heç zaman şanı, şöhrəti.
Olarmı şeirimin dadı, ləzzəti,
Bol məhsul yetirən çölüm olmasa.

Tanıtdı ellərə əzəllər məni,
Yazdığım şeirlər, qəzəllər məni.
Görsə uzaq düşər gözəllər məni,
Əhməd, şeir deyən dilim olmasa!

## AŞIQ ƏLƏSGƏRƏ

Sən bir sənət dahisisən,
Mən sənin övladın, ustad!
Ömür boyu ürəyimdə,
Həkk olubdur adın, ustad!

Mən cavanam, sən ulusan,
Qəlbi inciylə dolusan.
Aşıqların haqq yolusan,
Sönməz günəş oldun, ustad!

Əhmədəm, xoş niyyətim var,
Səninlə bir söhbətim var.
Bu qədər ki, qüdrətin var,
Kim olub ustadın, ustad?!

## NƏ GƏRƏKDİR

Birlə beşdə fərq bilməyən insana,
Əlli nə gərəkdir, yüz nə gərəkdir!
Ağıllılar məsləhətə tez yatır,
Ağılsıza yaxşı söz nə gərəkdir!

Vaxt səni salmamış ilməşik tora,
Pisliyə nifrət et, yaxşılıq ara.
Həyatı dərindən duymayanlara,
Doğru nə gərəkdir, düz nə gərəkdir!

Əhməd, zəhmətilə dolansın hərə,
Hamı şöhrət tapır ağlına görə.
Sabahı bu gündən görməyənlərə,
Hər şeyi tərs görən göz nə gərəkdir!

## GÖZƏLDİR

Nə kənddən doyuram, nə də şəhərdən,
Şəhər də gözəldir, kənd də gözəldir!
Ağzının dadını bilən insana,
Noğul da gözəldir, qənd də gözəldir!

Sən xeyir gözləmə hərcayi kəsdən,
Uzaq ol namərddən, yan keç xəbisdən.
Arayıb seçməyə yaxşını pisdən,
Fəhm də gözəldir, zənd də gözəldir!

Yaxşı olar dost qədrini billəndə,
İllər boyu bir danışıb güləndə.
Aşıq Əhməd, söz ürəkdən gələndə,
Misra da gözəldir, bənd də gözəldir!

## DÜŞMƏSİN

Çağırıldığın bir məclisə gedəndə,
Elə danış, sözün yekə düşməsin.
Sadə danış, sadə otur, sadə dur,
Ağzın çox yoxuşa-dikə düşməsin.

Gör necə parlaqdır günəşin üzü,
Dağıdır zülməti, açır gündüzü.
Qiymətli gövhərtək danış hər sözü,
Üstünə toz qonub, ləkə düşməsin.

Sözdədir xəyalın yetdiyi hünər,
Sözlə insan ömrü gülşənə dönər.
Əhməd, insan sözlə ucalar, enər,
Sadə danış, işin bərkə düşməsin.

## GƏRƏK

Söz var ki, qaytarıb udmasan olmaz,
Söz var, məqamında deyəsən gərək.
Şəkər dərd verərsə, yeməsən xoşdur,
Zəhər şəfa versə, yeyəsən gərək.

Gözün var, ağlın var, bil sərhədini,
Naqabil söz deyib aşma həddini.
Vüqarla tutsan da sən öz qəddini,
Qocaya, mərdə baş əyəsən gərək.

Əhməd, götür sazı, gəldi söz dəmi,
Yoxla pərdələri, düzəlt zil-bəmi.
Gülünc olmamaqçün yoluq qaz kimi,
Elin geydiyindən geyəsən gərək.

## TAPILMAZ

Şər işdən şər törər, xeyirdən xeyir,
Xeyirxah adamdan ziyan tapılmaz.
Dost-aşnanı yada salıb anmasan,
Sənin də dərdini duyan tapılmaz.

El ilə düz dolan, hörmətlə yaşa,
Səni xoş əməlin qaldırar başa.
Süfrən bağlı olsa qohum-qardaşa,
Sənə tikəsini qıyan tapılmaz.

Əhməd, mərdlik olsun eşqin, həvəsin,
Hər işdə el sənə afərin desin.
Çalış təmiz adın ləkələnməsin,
Ömür ləkəsini yuyan tapılmaz.

## ƏYİLMƏSİN

Kişi gərək mərd yaşasın,
Hər yetənə əyilməsin!
Elm oxusun, sənət seçsin,
İş bacarmır deyilməsin.

Könlü haqqa qüvvət versin,
Əsrimizə sürət versin.
Günəş olub həyat versin,
Dalda qalıb "döyülməsin".

Əhməd kimi söhbət açsın,
Çıraq olub şölə saçsın.
Bəd əməldən uzaq qaçsın,
Namərd olub söyülməsin!

## TANI

Könül, dost axtarıb yar seçən zaman,
Demirəm, gözündən-qaşından tanı.
Yoxla ilqarını, dəyanətini,
Onu əməlindən, işindən tanı.

Bağban şöhrət tapar bağça-barından,
İgid cürətindən, dağlar qarından.
Elin adətini adamlarından,
Ağacda yuvanı quşundan tanı.

Əhməd, bir süfrə aç söz sənətindən,
Hamı ləzzət alsın xoş nemətindən.
Hakimi hökmündən, ədalətindən,
İli baharından, qışından tanı.



SAZIMIZ – SAZBƏNDİMİZ



Musa NƏBİOĞLU

# XALQIMIZIN QƏDİM VƏ ÖLMƏZ SƏNƏTİ – SAZBƏNDLİK

Simli çalğı alətlərinin yaranmasına dair bir çox əfsanələr vardır. Bir rəvayətə görə, qartalın parçaladığı heyvanın bağırsaqları ağacın budaqlarına dolaşır, quruyub tarıma çəkilmiş bağırsaq külək əsdikcə titrəyərək müxtəlif səslər verməyə başlayır və bu səsləri eşidən qədim insanlar ilk simli çalğı alətlərini yaradırlar.

Burada müəyyən qədər həqiqətəuyğunluq var. Belə ki, tarixən simli çalğı alətlərinin gövdəsi, qolu və kəlləsi müxtəlif ağac növlərindən, simləri və qoluna bağlanmış pərdələri isə müəyyən üsullarla heyvan bağırsağından hazırlanıb.

**Saz** təzənə (mizrab) ilə çalınan simli musiqi alətidir. O, ulu ozan sənətinin davamçısı olan aşıq və saz-söz sənətinin ayrılmaz tərkib hissəsidir.

Türk mənəviyyatının rəmzlərindən biri olan saz və sinkretik, yəni özündə çalğı, oxuma, şeir demə, söz və dastan ifaçılığı, aktyorluq və rəqs (plastika) sənətlərini birləşdirən saz-söz sənəti Azərbaycan milli mədəniyyətinin ən qədim qatları ilə bağlıdır. Qədim türkdilli xalqlarda şaman, qam, oyun, baxşı, yanşaq, varsaq və nəhayət, ozan kimi tanınan sənətkarlar bugünkü aşığın əcdadları sayılırlar. Ozan sənəti əsrlər boyu böyük təkamül yolu keçərək aşıq sənətinə çevrildiyi kimi, qopuz da ona oxşar təkamül yolu keçərək saz aləti şəklini almışdır.

Saz artıq Şah İsmayıl Xətainin dövründə (XVI əsr) indiki şəklini almışdı. Şah İsmayıl Xətainin könül oxşayan qoşmalarının birində saz belə tərənnüm edilir:

*Bir gün ələ almaz olsam mən sazım,*
*Ərşə dirək-dirək çıxar mənim avazım.*
*Dörd iş vardır hər qarındaşa lazım:*
*Bir elm, bir kəlam, bir nəfəs, bir saz.*

Azərbaycan sazı türkdilli xalqlar arasında yayılmış saz və ona oxşar alətlərdən çalğı texnikası, akustikası baxımından özünəməxsus üstünlükləri ilə seçilir. Sazın çanağı tut ağacının seçmə növlərindən, qolu isə qoz ağacından hazırlanır. Sazın hazırlanmasında hər şeydən əvvəl ağac materialının keyfiyyətinə diqqət yetirilməlidir. Məşhur sazbənd **Xudunun** oğlu, bu sənətin ləyaqətli davamçısı **Fərman Xuduoğlu** bu barədə belə deyir: “Usta gərək hər şeydən əvvəl işlədəcəyi ağac materialını seçə bil-



sin, hər ağacdan saz düzəltməsin. Yəni yaxşı sənətkar əvvəlcə materialı seçməyi bacarmalı, sonra işə başlamalıdır. Bu da ustadan böyük qabiliyyət tələb edir. Usta ağaca baxanda bilməlidir ki, bu ağacdan nə çıxar. Bilməlidir ki, bu ağac güneydə (dəmyə yerdə) bitib, yoxsa quzeydə (sulu yerdə). Bunların möhkəmliyində və çəkisində fərq olur. Əlbəttə, dəmyə yerdə bitən ağac daha yaxşıdır. Sazın çanağında istifadə ediləcək taxtada bunlar mütləq nəzərə alınmalıdır. Amma bəzən görürsən ki, mən də sazbəndəm deyən biri hansısa ustadın düzəltdiyi sazı götürüb yüzdə yüz hər şeyi (taxtanın qalınlığını və s.) eynilə təkrarlayır. Daha nəzərə almır ki, bu ağac hansı mühitdə böyüyüb, onun taxtasının möhkəmliyi, çəkisi necədir...”

Saz düzəltmək üçün seçilən ağacın yaşına və hansı mühitdə - quzeydə, yoxsa güneydə yetişməsinə mütləq diqqət yetirilməlidir. Ağacın yaşından çox şey asılıdır. Məşhur sazbəndlər hər ağacdan saz düzəltməyib, keyfiyyətli ağac materialı üçün el-el, oba-oba gəzib, daha çox 80-100 yaşlı ağaclara üstünlük veriblər. Çanağın düzəldilməsində istifadə olunan tut ağacı kimi, sazın qolu düzəldilən qoz ağacının da quzeydə, yaxud güneydə bitməsi nəzərə alınmalıdır. Tut ağacı ilə qoz ağacının uzlaşması, bir-birinə uyğun gəlməsi də vacib şərtdir. Yəni müxtəlif şəraitdə yetişmiş ağaclardan taxtanı eyni qalınlıqda yonmaq olmaz. Ağacın məsamələrinə əsasən taxtanın (qabırğaların) çəkilmə istiqaməti xüsusi rol oynayır. Qabırğalarda məsamələr ya perpendikulyar, ya da maili olmalıdır. Quzeydə bitən ağacdan alınan taxta güneydə bitən ağacınkına nisbətən nazik olmalıdır. Güneydə bitən ağac yaxşı qaralır, qurutduqdan sonra onu istənilən formaya salmaq olur. Quzeydə bitən ağaclar isə sulu olduğundan yaxşı qaralmır, əyilməyə meyilli olur. Adicə barmağın tərindən canına su çəkir.

Saz düzəltmək üçün seçilmiş ağacın kəsilmə vaxtı mütləq nəzərə alınmalıdır. Kəsilən ağac qabığı soyulmadan kölgədə, gün dəymədən ən azı 8-10 il qurudulmalıdır. Gərək ağac yazda torpaqdan canına su çəkməmiş kəsilsin. Ümumiyyətlə, ağacların şirəvermə dərəcəsi ən çox yanvar, fevral aylarında azalır. Çanağın hazırlanması üçün nəzərdə tutulmuş ağacı da bu aylarda kəsmək lazımdır. Bu onunla əlaqədardır ki, şirəsi çox olan ağacdan hazırlanmış çanaq bir qədər quruduqdan sonra çatlayır və yaxud deformasiyaya uğrayır. Çanaq yonulduqdan sonra uzun müddət xüsusi temperaturda, qaranlıq yerdə ən azı 2-3 il qurudulmalıdır.



İstənilən çalğı alətinin, o cümlədən sazın çanağını hazırlamaq üçün kəsilmiş ağac gövdəsini ikiyə bölüb, özəyi çıxarmaq lazımdır. Təcrübə göstərir ki, yaşı çox və özəyi boş olan ağacdan istifadə etmək məqsədəuyğundur.

Sazbəndlər **Kövrək Murad** və **Bafəli Adıgözəlov** da saz düzəltməyin vacib şərtlərindən danışarkən deyirlər ki, saz düzəltmək üçün istifadə olunan tut və qoz ağacları nə qədər yaşlı olsa, bir o qədər yaxşıdır.

Tut ağacından 50 ***sm***-lik götük kəsdikdən sonra onu 4 hissəyə bölmək lazımdır ki, tərsini, avandını biləsən. Ağacın gün döyən tərəfindən sazın sinəsi üçün istifadə etmək lazımdır. Geridə qalanlardan isə qabırğa üçün istifadə etmək olar. Yeri gəlmişkən, bəzən qabırğa düzəltmək üçün qaraağac, çinar və gilasdan da istifadə edənlər olsa da, bu ağacların heç birindən alınan taxtanın əyilmə effekti tut ağacındakı kimi olmur. Qoz ağacını isə 1 ***m*** uzunluqda kəsmək lazımdır ki, qurudarkən uclarda əmələ gələn çatları kəsib götürdükdən sonra qol düzəltmək üçün normal uzunluq qalsın. Sazı düzəldərkən hər bir hissənin ölçülərinə diqqət etmək də vacib şərtdir, yəni bunların da öz standartları var.



Beçə (qolu çanağa birləşdirən hissə), qol, aşıqlar və sazı beçəyə və içəri yamşağa birləşdirən ağac çüylər (mismar əvəzi ağacdan düzəldilən hissələr) qoz ağacından olur. Tut ağacından isə sazın çanağı – qabırğalar və sinə düzəldilir. Ana qabırğanın qalınlığı 5 ***mm*** olmalıdır, hündürlüyü isə sazın çanağının böyük və ya kiçikliyindən asılıdır. Ana sazın ana qabırğasının bir ucunda eni 12-14 ***sm***, o biri ucda isə 4-5 ***sm*** olmalıdır. Bala qabırğalar isə 5-6 ***sm*** enində olsa kifayətdir.

Saz böyük və ya kiçikliyindən asılı olmayaraq aşağıdakı hissələrdən ibarətdir: 1. Qabırğa; 2. Beçə içəri yamşaq; 3. Ağac çüylər; 4. Çöl yamşaq; 5. Xatabənd qoliçi oyma; 6. Sinə (döş); 7. Daraq; 8. Sinə xərək; 9. Baş xərək; 10. Aşıqlar (burma qulaqlar); 11. Pərdə; 12. Sim bağı; 13. Sim; 14. Təzənə; 15. Qayış (çiyinə keçirmək üçün) bəndləri; 16. Köynək.

Çox hallarda alətin qolu və çanağın yan tərəfləri təbii sədəflə bəzədilir. Əsas saz hesab edilən tavar sazın ümumi uzunluğu 1.200 ***mm***, çanağının dərinliyi 200 ***mm*** olur. Təmiz qara sazın normal çəksi onun ölçülərindən asılı olaraq 700 qramdan 1.100 qramadək olur. Balaca sazın çəkisi isə 300-400 qram olmalıdır.

Digər simli çalğı alətlərində olduğu kimi, saz da üç əsas hissədən ibarətdir:



1. **Çanaq** (gövdə). Burada səs rezonansı yaranır, formalaşır və güclənir.

**2. Beçə**. Sazın çanağını qol hissə ilə birləşdirir.

**3**. **Qol**. Çanağa rezonans verən simlər qolun üstündən keçərək sol əlin barmaqları ilə hissələrə bölünür ki, bu da müxtəlif səslərin alınmasına imkan verir.

Çanağın gövdəsi bir-birinə bərkidilmiş tək sayda (adətən 9) taxta "qabırğa"lardan ibarətdir. Bu "qabırğa"lar qol ilə çanağı birləşdirən "küp" adlı kiçik hissənin üzərində yığılır.

Hazır olmuş çanağa qol əlavə edilir. Bu zaman qol ilə çanağın tarazlığına xüsusi fikir vermək lazımdır. Qol çanağa birləşdirildikdə dəqiqliyi tam saxlamaq üçün xüsusi xətkeşlərdən istifadə edilərək, qolun kəllə ilə birləşdiyi hissə 5 ***mm*** aralı qoyulur ki, simlər köklənərkən qol qabağa gəlib öz yerini alsın. Qol hissəni hazırlayarkən materialın möhkəmliyinə xüsusi fikir vermək lazımdır, çünki alət kökləndikdə güclü təzyiq altında olan qolda əyilmə (çəngəl) ola bilər.

Çanaq ilə qol birləşdikdən sonra sazın üz hissəsi quraşdırılır. 5 ***mm*** qalınlığında tut və ya qoz ağacından hazırlanmış üzlük əsasən, bəzir və ya zeytun yağı ilə yağlanıb bir neçə gün saxlanılır. Yağı tamamilə özünə çəkdikdən sonra o, odun üstünə tutularaq qurudulur (bişirilir). Bir neçə gündən sonra bu proses bir daha təkrar edilir. Hazır olmuş üzlük xüsusi ağac yapışqanı ilə çanağın üzərinə bərkidilir.



Sazın səslənməsi onun necə quraşdırılmasından çox asılıdır. Çanaqlar tam quruduqdan sonra onun iç və çöl tərəfləri bir qədər də yonulub hamarlanır və bundan sonra qol, kəllə və başqa hissələri quraşdırılır. Çanağın üzərində qoyulmuş böyük xərək simlərin ehtizazını qəbul edir və çanağın daxilindəki boşluğa verir. Bu boşluqda formalaşan səs dalğaları yenidən üz hissəyə qayıdır. Bu halın bir neçə dəfə təkrarı nəticəsində səs güclənir, uzanır, beləliklə, dolğun tembrli səs çalarları əldə olunur.

Alətin quraşdırılmasında, əsasən, sümükdən və balıq yağından bişirilərək hazırlanmış taxta yapışqandan istifadə edilir. Hissələr hamarlandıqdan və təmizləndikdən sonra üzərlərinə isti halda nazik yapışqan sürtülür və üst-üstə qoyularaq güclü təzyiqlə sıxılır. Bütün hissələr birləşdikdən sonra aşıqlar və pərdələr quraşdırılır.

**Qola** 16-17 pərdə bağlanılır. Sazbənd Usta Xudunun sayəsində qol, beçə və sinə pərdələri (pərdə və yarımpərdələrlə birlikdə) 23-ə çatdırılıb. Azərbaycanda ölçüləri ilə fərqlənən iri tavar sazın 11, ana sazın 9, bəzən

8 simi, ondan bir qədər yığcam orta, yaxud qoltuq sazın 6, bəzən 7 simi, kiçik cürə sazın isə 4-6 simi vardır. İlk olaraq Aşıq Əmrah Gülməmmədov sazı təkmilləşdirərərk 11 simli edib.

**Sim,** simli musiqi alətlərində, o cümlədən sazda səs rəqslərinin mənbəyidir. Qədim zamanlarda sim ağac qabığından, bitki lifi və ya heyvan (at və s.) tükündən hazırlanırdı (ASE VIII cild). Müasir dövrdə isə əsasən metal (polad) simlərdən istifadə olunur. Metaldan olan simlər daha güclü və təmiz səs versə də, ifa zamanı barmaqla sıxarkən ipək və bağırsaqdan hazırlanmış simlərə nisbətən daha sərt olur. Bir vaxtlar simlər yüksək keyfiyyətli poladdan hazırlanıb, gümüş suyuna salınarmış. Onlar heç zaman paslanmaz və çox az halda qırılarmış.

Simlərin baş tərəfi ilgək edilərək çanağın aşağı tərəfində yerləşdirilmiş xüsusi simgirlərə keçirilir. Simgir metal, ebonit və yaxud möhkəm ağac materialından hazırlanır.

**Xərək** - simli musiqi alətlərində, o cümlədən də sazda simin səslənən hissəsini məhdudlaşdıran və simlərin rəqsini üst dekaya ötürən ağac hissədir. (ASE X cild, səh. 78) Kiçik taxta parçasından ya da mal buynuzu qırığından emal olunur. Xərək simlərin ehtizazını musiqi alətinin çanağına (gövdəsinə) ötürməklə səsi gücləndirir.

**Aşıq** simli musiqi alətlərinin kəlləsində simlərin sarıldığı zivanadır (balaca paya, qulaq). Aşıqların hazırlanması üçün ən yaxşı material armud ağacı sayılır. Ondan hazırlanmış aşıqlar kökü dəqiq saxlayır, atmosfer təzyiqinə davamlı olur.

**Pərdə** bəzi simli musiqi alətlərinin, (tar, saz, dütar, tənbur və s.) o cümlədən də sazın qoluna bağlanılan bölmədir, müxtəlif yüksəklikli səsləri bir-birindən ayırmaq üçün istifadə olunur (ASE, 7-ci cild, səh. 524). Əvvəllər qoyun bağırsağından nazik kəndir kimi eşilib emal edilib, at tükündən hazırlanıb. Son vaxtlar da isə daha möhkəm və davamlı sayılan kapron sapdan istifadə olunur. Əsas pərdələrdən hərəsinin öz adı var: baş pərdə, şah pərdə divani pərdə, beçə pərdələr və s.

Sazın simlərini səsləndirmək üçün təzənədən istifadə olunur.

**Təzənə** - albalı və gilas ağaclarının, əsasən də meşədə bitən yabanı gilas ağacının qabığından düzəldilir. (ASE IX cild, səh. 240)



*Unutsaq - unudularıq*

# SAZBƏND MƏHƏMMƏDƏLİ

Bu gün sazbəndlikdən söz düşəndə Məhəmmədəli kişinin adı birincilər sırasında çəkilir. İstər aşıqlar, istərsə də sazbəndlər onu böyük minnətdarlıq hissi ilə xatırlayır, bir ustad sazbənd kimi işini yüksək dəyərləndirir, sazbəndlər üçün bu gün də örnək olduğunu vurğulayırlar.



***Sazbənd Məhəmmədəli (sağda) və aşıq Hüseyn Sarıyev***

Məhəmmədəli Abbasqulu oğlu Məhərrəmov 1893-cü ildə Naxçıvanın Şərur rayonunun Qorçulu kəndində kasıb bir ailədə anadan olub. Çox erkən yaşlarından valideynlərini itirən Məhəmmədəli 1918-1920-ci illərdə ermənilərin xalqımıza qarşı törətdikləri vəhşiliklərdən yaxa qurtarmaq üçün kiçik qardaşını və bir neçə yaxın qohumunu da götürərək Qazax rayonuna gəlib və burada məskunlaşıb. O dövrün çətinlikləri burada onun həyat tərzinə öz təsirini göstərib. Sazbəndliyə olan həvəsi və bu sahədəki qabiliyyəti onu ötən əsrin 30-40-cı illərində bu sənətə gətirib çıxarıb.

İkinci dünya müharibəsi onun həyatına da təsirsiz ötüşməyib. Müharibə başlayanda yaşlı olduğundan onu döyüşən ordu sıralarına aparmasalar da, ehtiyatda olan hərbi hissəyə çağırıblar. Cəbhəyə yollanan kiçik qardaşı isə bir daha geri qayıtmayıb və qardaş itgisi onun həyatında silinməz iz qoyub.

1945-ci ildə ordudan tərxis olunduqdan sonra ailə həyatı qurub. Lakin birinci evlilikdən uşaqları olmadığından ikinci dəfə evlənib.



***Şəkildə soldan: Sazbənd İsgəndər Budaqov, usta Məhəmmədəli və qızı Xurəmzə, həyat yoldaşı Pəri, qız nəvəsi Elşad. 1971-ci il.***

Qısa müddətdə sazbənd kimi təkcə Qazaxda deyil, ətraf rayonlarda, Göyçədə və Borçalıda da məşhurlaşan Məhəmmədəli kişinin evi sənət ocağına çevrilmiş, dövrünün məşhur aşıqlarından Əmrah Gülməmmədov, Kamandar Əfəndiyev, Hüseyn Saraçlı, Xındı Məmməd, Cəlal Qəhrəmanov, Kərəm Nəsibov, Məhəmməd Şıxlı, Şəhadət Gülməmmədov və digərləri tez-tez onun qonağı olub, düzəltdiyi sazda çalıb-oxuyublar.



Məhəmmədəli Məhərrəmovun şəyirdi olmuş sazbənd İsgəndər Budaqov həm öz ustadı, həm də adlarını çəkdiyimiz aşıqlar haqqında minnətdarlıqla söz açaraq deyir ki, onların hər biri ayrıca bir məktəb idi. Ustadının alicənablığından, səxavətindən danışaraq xüsusilə vurğulayır ki, Məhəmmədəli kişi hər şeyin yerini bilən, əliaçıq, qonaqpərvər bir kişi idi. Qapısı həmişə qonaq üzünə açıq olardı. O, belə bir əhvalat da danışır ki, bir dəfə Novruz bayramı ərəfəsində həyat yoldaşı Pəri xanım bayram bazarlığı etmək üçün Məhəmmədəli kişidən pul istəyir. Həmin ərəfədə pulu olmayan usta cavab verir ki, cəmisi 30 manat pulum var, onu götür

get bazara, nə düşür al. Pəri xanım da bu pulla istədiyini ala bilməyəcəyini söyləyib, bazara getmir. Həmin günün axşamı Əmrah Gülməmmədovla Kamandar Əfəndiyev onlara gəlirlər, özü də böyük bayram sovqatı ilə...

Sazbənd Məhəmmdəli kişinin sənətkarlığı istər aşıqlar, istərsə də folklorşünaslar, aşıq sənətinin biliciləri tərəfindən hər zaman layiqli qiymətini alıb. Haqqında qəzetlərdə yazılar yazılıb. Ömrünün son illərində - 1971-ci ildə Xalq şairi Hüseyn Arifin köməkliyi ilə Qazax rayonunda milli adət-ənənələrimizlə bağlı çəkilən qısametrajlı filmdə Məhəmmədəli Məhərrəmov haqqında da məlumat verilib.

1972-ci ildə dünyasını dəyişən Məhəmmədəli Məhərrəmov Qazaxda dəfn olunub. Ölümündən qırx ilə yaxın bir vaxt keçməsinə baxmayaraq bu gün də xatirəsi əziz tutulur, sazdan, sazbənddən söz düşəndə adı minnətdarlıqla anılır, böyük sənətkar olması dönə-dönə vurğulanır.

**M.Nəbioğlu**



**ZƏKİ İSLAM**



# GƏL

### I hissə

Sən Göyçənin ellərinə,
Zimistanı çıxanda gəl.
Yamacda tütək səsinə,
Maral dönüb baxanda gəl.

Təkağacdan, Toxlucadan
Ləzzət alır sökülən dan.
Yaşıl çəmən Ağbulaqdan,
Döşlərə gül taxanda gəl.

Ensən Şorcanın başına,
Asta sürət ver maşına.
Ürək açan Üçdaşına,
Gecikmə, gün çıxanda gəl.

Adatəpə, Uca Yalnan,
Doyunca gəz, ləzzət alnan.
Təzə işxan kababınnan,
Çəkib şişə taxanda gəl.

Göyçə gözəllik diyarı,
Ardanışda dayan barı.
Addımlasan Cilə sarı,
Sinənə söz axanda gəl.

Arxa verib Şahdağına,
Nəzər sal bağça-bağına.
Cilin Pəri bulağına,
Duman dağdan qalxanda gəl.

En aşağı Babacana,
Bax qonağa, canhacana.
Pəmbək, Dərə hər zamana,
Dost əlini sıxanda gəl.

Keç Güneydən Sarınərə,
Şişqayadı xoş mənzərə.
Səcdə qılnan Ələsgərə,
Ustad kamal baxanda gəl.

İnəkdağı, Məzrələri,
Göysu, Kəsəməndən bəri.
Şorcalarda gəzən pəri,
El yaylağa çıxanda gəl.

Qaraiman, Qoşabulaq,
Daşkənddə gəz soraq-soraq.
Qanlı, Kərkibaş, Qırxbulaq,
Bu yerlərə axanda gəl.

Könül istər şirin dili,
Dər Keytidə hər bir gülü.
Zod, Nərmanlı, Göyçə gölü,
Bəzən, şimşək çaxanda gəl.

Canəhməddən, Ağyoxuşa,
Zərkənddən də Qayabaşa,
Gödəkbulaq xoş tamaşa,
Bahar qışı yıxanda gəl.

Basarkeçər üzük qaşı,
Yarpızlı tarix yaddaşı.
Zal nəsili el sirdaşı,
Düşmən qorxub qaçanda gəl.

Sarıyaqub, Qaraqoyun,
Bu diyardan öyrən oyun.
Bulaqlardan su iç, yuyun,
Aran səni sıxanda gəl.

Asta keç sən Ağkilsədən,
Sazın səsi gəlir hərdən.
İsmixandan, Haqverdidən,
Şeirə şölə saçanda gəl.

Burda olmuş Növrəs İman,
Nərmanlıda şair Bəhman.
Aşıqlardan ilham alsan,
Şirin layla çalanda gəl.

Çaxırlıdan sərin su iç,
Ağzıbirdən o səmtə keç.
Axtarmaqdan doymaram heç,
Eşq sinənə çaxanda gəl.

Hacımuğanın gözəl yazı,
Ağbulaqdan götür sazı.
Toxlucadan seç Eyvazı,
Meyli saza axanda gəl.

Həzin-həzin əsir külək,
Güllərini şeh öpərək.
Qonağımsan, demə görək,
Gün dağlara yaxanda gəl.

Qızılvəngli Aşıq Alı,
Fəxr edir Göyçə mahalı.
Bəndə salmışdı Yığvalı,
Qarsda meydan açanda gəl.

Axtar mərdi, dost tutanı,
Bu diyarı yaxşı tanı.
Arxayın gəz Subatanı,
Gün dağlara yaxanda gəl.

Gəz Göyçəni başdan-başa,
Qon kəklik tək daşdan-daşa.
Zəki İslam, yaşdan yaşa
Ömür yolu axanda gəl.

## II hissə

Mən Göyçəni Göyçə kimi,
Düz qələmə almamışam.
Bax, aradan qırx il keçib,
Doğru qələm çalmamışam.
Min doqquz yüz altmış altı,
Niyə halı olmamışam?
İndi isə ikin min altı,
Bir kamala dalmamışam.

Göyçəni güney tərəfdən,
Altmış altıda yazmışam.
O tay deyilən qüzeydən,
Yan keçib yolum azmışam.
Min doqquz yüz qırx səkkizi,
Könüllü köçkün yozmuşam.
Amma belə deyilmiş bu,
Yaman nankor olmuşam.

Göz dağıydı millətimə,
Yuxarı, Aşağı Zağa.
Çamırlıdan, Tüstülüdən,
Mollalıdan dönüb sağa.
İki Gözəldərə kəndi,
Zülümlərə qaldı, qağa.
Qızılxaraba kəndində,
Min evdən xəbər almışam.

Baş Qaraqoyun, Zolağac,
Əliqırıx kəndi gözəl.
Abdalağalı, Qaranlıq,
Aşağı Qaranlıq əzəl.
Böyük, Kiçik Adyamanlar,
Kürdxaraba olmuş xəzəl.
Mədinədi babam yurdu,
Yanıq kənddən gəlməmişəm.

Böyük Dəlikdaş, Təzəkənd,
Ah-nalədən oda yandı.
Kiçik Dəlikdaş, Gölkənd,
Qar-boranda qana qandı.
Hətəmxanlı, Vəlağalı,
Kəsikbaş da adın andı.
Güzəciklə, Qulalının,
Ah-naləsin unutmuşam.

Qırmızı kəndlə Qışlağı,
Babalarım yurda seçib.
Kərim kəndi Sarıxanla,
Başkəndi də orda seçib.
Paşa kəndi, Paşalar,
Kosaməmməddən xan keçib.
Nər düzü Nərədüzü də,
Şeiriyyətdə yanıltmışam.

Hər tərəfi cənnətməkan,
Kəvəri unutmaq olmaz.
Kəvər şəhəriydi, şəhər,
Əyrivəngi qatmaq olmaz.
Ağqalanın bağ baxçası,
Quylu kənddən doymaq olmaz.
Ağzıbirlə, Hacımuğan,
Azadxarabada solmuşam.

Hacımuğan Haq-taladan,
Baba yurdum, Baba yaylaq.
Rəhimkənd, Əfəndi, Bığlı,
Ördəklini bolluq sayaq.
Yelenovka Çıvıxlıyla,
Abdal-Gülablı şah oylaq.
Çalmalıynan Şişpiləkənə,
Bir səthi qələm çalmışam.

Yarpızlı, Alçalı, Şəhriz,
Adyamanın adı hanı?
Gödəkbulaq Atdaşıyla,
Qızılbulaq, Şır-şır şanı.
Yurdları xaraba qoydu,
Min doqquz yüz beş tufanı.
On səkkizi, qırx səkkizi,
Səksən səkkizdə qanmışam.

Soyqırımı törədənlər,
Ermənidi, haray salır.
Dənizdən dənizə mənim,
Deyə-deyə yazıqlanır,
Arxası çox qüvvəlidi,
Müvəqqəti əl də çalır.
Zəki İslam, haqq oyaqdı,
Haqqa pənah aparmışam.

**Araz YAQUBOĞLU**
***"Qızıl qələm" mükafatı laureatı***



# AŞIQ ORUCUN SAZLI-SÖZLÜ DÜNYASI

Ustad sənətkarın ömrü onun daşıyıcısı olduğu sənətin ömrü qədər olur. Aşıq sənəti "sələfdən-xələfə, ustaddan-şagirdə keçə-keçə bir zəncirin həlqələri kimi uzaq əyyamların sirrini-sorağını telli sazda əks-sədaya çevirən sənət məbədi olmuşdur".[1]

Bu sahənin inkişafında xidməti olan aşıqlardan Aşıq Vəlinin və xüsusən də onun oğlu Aşıq Orucun adını iftixarla çəkmək olar. Oruc Vəli oğlu Əhmədov 1920-ci il martın 20-də Göyçə mahalının Yarpızlı kəndində dünyaya gəlib. Anasının adı Qəndab olub. Atası Vəli (1854-1929) Əhməd oğlu Göyçə mahalında və Azərbaycanın digər bölgələrində tanınmış aşıq olmuşdur. Ustadı Aşıq Alıdan mükəmməl dərs alan Aşıq Vəli uzun zaman Aşıq Qulu (1860-1935) ilə birgə məclislər yola salmışdır. O, Azərbaycanın əksər bölgə və mahallarında keçirdiyi toylarda oxuduğu mahnılar və söylədiyi dastanlarla el-obanın hörmətini qazanmışdır. Aşıq Vəli böyük maarifpərvər yazıçı, dramaturq Nəcəf bəy Vəzirovla dost olmuş, dəfələrlə Qarabağda, Dilican bölgəsində onun apardığı toy və məclislərdə iştirak etmiş, "Hacı Qənbər" komediyasında Aşıq Vəli obrazını yaratmışdır. Aşıq Vəlinin "səsi o dərəcədə zil və güclü imiş ki, yandırılan otuzluq lampaları, çıraqları belə keçirə bilirmiş".[2]

Atası Vəli vəfat etdikdən sonra Oruc onun sazını susmağa qoymamış, çalıb-oxumağa başlamışdır. O, bir neçə il Aşıq İbrahim Alışan oğlu İsgəndərovun şəyirdi olub və sonra müstəqil olaraq aşıqlığa başlayıb.

Professor Qara Namazov "Aşıqlar" kitabında Aşıq Orucun haqqında yazır: "1939-cu ildən müstəqil aşıqlığa başlayan Oruc Göyçə aşıq məktəbinin çox çətin imtahanlarından keçib. Həm məlahətli səsi, saz tutma məharəti, həm də şair aşıq kimi tanınmışdır". Qara müəllim kitabda

[1] Qara Namazov, "Aşıqlar" I kitab, Bakı, "Səda" 2004. səh.3.
[2] Azad Ozan Kərimli, "Göyçə aşıq məktəbi", "Musiqi dünyası" jurnalı, №2(3), 2000. səh.83.

aşığın "Kölgəsiz" rədifli şeirini də nümunə kimi oxuculara təqdim etmişdir.[3]

1945-ci ildə Aşıq Oruc Züleyxa Allahverdi qızı ilə ailə həyatı qurub (Aşıq Orucun 1926-cı ildə anadan olmuş ömür-gün yoldaşı Züleyxa xanım aşığın ölümündən sonra 35 il yaşamış, 9 uşaq - 6 oğul, 3 qız övladını böyüdüb boya-başa çatdırmış, 2011-ci il iyul ayının 9-da dünyasını dəyişmişdir. Allah rəhmət eləsin!), gözəl ailə başçısı, övladlarına sevimli ata olmuşdur. 1949-cu ildə ermənilərin mənfur siyasəti nəticəsində doğma kəndlərindən deportasiya olunanda Gədəbəy rayonunun Zəhmətkənd kəndində məskunlaşmışdır.

Azərbaycanda aşıqlar arasında tezliklə tanınan ustad Aşıq Oruc Əhmədov respublikada keçirilən mədəni-kütləvi tədbirlərdə, festivallarda, əmək bayramlarında aktiv iştirak etmişdir. İsfəndiyar Rüstəmov və Aşıq Oruc haqqında "El sənətkarları" məqaləsində oxuyuruq: "Onları şöhrətləndirən öz üzərlərində işləmələri, aşıqlığın bütün incəliklərinə dərindən yiyələnmələri olmuşdur. İndiyədək rayonumuzda (Gədəbəydə – A.Y.) elə bir yığıncaq, şənlik və konsert olmamışdır ki, İsfəndiyarla Orucun məlahətli səsi orada eşidilməsin".[4] Məqalədən də göründüyü kimi, Aşıq Oruc dövrünün ən aktiv aşıqlarından olmuşdur. "Aşıq Oruc xidmətlərinə görə respublika II aşıqlar qurultayına (*III Aşıqlar qurultayına* – A.Y.) nümayəndə seçilmiş, xalq yaradıcılıq evinin fəxri nişanı ilə təltif edilmiş və pul mükafatına layiq görülmüşdür".[5]

Professor Məhərrəm Qasımlı Aşıq Orucun həyat və fəaliyyəti haqqında "Ədəbiyyat qəzeti"ndəki "Ustad" başlıqlı məqaləsində yazır: "1953-cü ildə Aşıq Oruc Gədəbəydə aşıqlar ansamblı yaradır və iyirmi ilə yaxın ansambla rəhbərlik edir. Onun ansamblında yetişmiş İsfəndiyar Rüstəmov, Sədaqət Rəsulov, Zahid Aslanoğlu, Fəzayıl İsmayılov, Şahsuvar Fərzəliyev, Yusif Quliyev və onlarca başqaları indi el məclislərinin sevimlisidir. El sənətinin inkişafında xidmətlərinə görə Aşıq Oruc Azərbaycan Mədəniyyət Nazirliyinin Fəxri fərmanına və bir neçə dəfə pul mükafatına layiq görülüb".[6] Qəzetdə həmçinin ustadın "Neyləsin" adlı gəraylısı, "Yar sinə-sinə" adlı təcnisi və "Qıfılbənd" ("Kölgəsiz" – A.Y.) başlıqlı qoşması olmaqla üç şeiri çap olunmuşdur.

---

[3] Qara Namazov, "Aşıqlar" I kitab, Bakı, "Səda" 2004. səh.331-332.
[4] "El sənətkarları", Tərəqqi qəzeti (Gədəbəy), №83, 16 iyul 1970-ci il.
[5] İsfəndiyar Əliyev, "Ürəklərə yol tapır", Tərəqqi qəzeti (Gədəbəy), №58, 20 may 1969-cu il.
[6] Məhərrəm Qasımlı, "Ustad", Ədəbiyyat qəzeti, №8, 22 fevral 1991-ci il.



Aşıq Oruc ifaçı aşıq olmaqla yanaşı həm də yaradıcı aşıq olub. O, aşıq şeirinin demək olar ki, hər şəklində - gəraylı, qoşma, təcnis, divani, müxəmməs və başqa janrlarda şeirlər yazmışdır. Onun yaradıcılığı haqqında Əli Əliyev "El aşığı" məqaləsində belə qeyd edir: "O, yalnız ustad aşıqların sözlərini oxumaqla kifayətlənmir. Həm də özünün, xalqın xoş güzəranından, vətənin gündən-günə artan qüdrətindən və onun gələcəkdə daha qüdrətli olmasından ilham alaraq yazdığı şeirində deyir:

*Qəhrəman yurdudur mənim bu yurdum,*
*Poladdan möhkəmdir yenilməz ordum.*
*Aşıq Oruc deyər: hər kimdən sordum,*
*Dedi: - Bundan gözəl sabahımız var."*[7]

Sənətşünaslıq namizədi Azad Ozan Kərimli "Göyçə aşıq məktəbi" adlı silsilə məqalələrində Aşıq Oruc Əhmədovun "Neyləsin" gəraylısını, "Yar sinə-sinə" təcnisini və "Qıfılbənd" qoşmasını çap etdirmişdir.[8]

Aşıq Oruc çətin oxunan "Koroğlu", eləcə də az istifadə olunan "Mixəyi", "Güllü qafiyə", "Göyçə gözəlləməsi" (bu havaya "Nəcəfi" də deyirlər), "Mirzəcanı", "Məmmədhüseyni" havalarını gözəl ifa edərmiş. O, ümumilkdə 70-ə qədər saz havasını çalıb-oxuyur və neçə-neçə dastanları bütünlüklə mükəmməl bilirmiş. Radionun qızıl fondunda onun ifasında 11 mahnı saxlanılır. Qurbani dastanı 1954-cü ildə Aşıq Orucdan yazıya alınmışdır. Professor M.Qasımlı bu dastanın əhəmiyyətini göstərərək yazır: "Bütün başqa variantlara nisbətən daha dolğun və əhatəli bu variantdır".[9]



**Aşıq Orucun sənət şəcərəsi**

[7] Əli Əliyev, "El aşığı", Tərəqqi qəzeti (Gədəbəy), №103, 31 avqust 1971-ci il.
[8] Azad Ozan Kərimli, "Göyçə aşıq məktəbi", "Musiqi dünyası" jurnalı, №3-4(9), 2001. səh.140-141.
[9] Məhərrəm Qasımlı, "Aşıq sənəti", Bakı, "Ozan", 1996. səh.136.

Aşıq Oruc Miskin Vəli və Aşıq Məhəmmədəli ilə bərabər neçə-neçə məclislər keçirib. Ondan dərs alan aşıqlar çox olsa da, onun əsas şəyirdləri Aşıq Şahsuvar və Aşıq Nurəddin olmuşdur.

Əməkdar mədəniyyət işçisi Aşıq Oruc 1976-cı il iyulun 19-da Gədəbəy rayonunun Zəhmətkənd kəndində vəfat etmiş və həmin kənddə də dəfn olunmuşdur.

Sonda onu da vurğulamaq istərdik ki, AMEA Dilçilik İnstitutunun şöbə müdiri, filologiya elmləri doktoru, professor İsmayıl Məmmədli atası Aşıq Orucun və babası Aşıq Vəlinin həyat və fəaliyyətlərinə dair xeyli materiallar toplamışdır. Həmin materiallar kitab şəklində çapa hazılanır. İsmayıl müəllim dilçilik üzrə alim olsa da, onun “Azərbaycan dilinin etnoqrafik leksikası” adlı monoqrafiyası da çap olunmuşdur. O, sazın-sözün vurğunu kimi folklorçuluq ənənələrini davam etdirərək özü də vaxtaşırı Azərbaycanın müxtəlif aşıqları haqqında maraqlı yazılarla mətbuatda çıxışlar edir.

**Aşıq Oruc Əhmədov**

## NEYLƏSİN
**(*Gəraylı*)**

Öz eybini bilməzlərə
Qohum-qardaş, el neyləsin?!
Zatı xain olan kəsə
Düzgün ürək, dil neyləsin?!

Elmə sinə gərməyənə,
Ustad dərsi görməyənə,
Düzə qiymət verməyənə,
Alim, şair bil, neyləsin?!

Eli sevər ər oğlu ər,
Qanı təmiz, canda hünər.
Haqsız ölsə - nadan, sərsər,
Ona külüng, bel neyləsin?!

Sarvan ümid bağlar nərə,
Şair olan şah əsərə,
Səyyah yorğun, çətin bərə,
Ovun getsə, sel neyləsin?!

Aşıq Oruc, de sözünü,
Tərifləmə gəl özünü.
Bil, çevirsə el üzünü,
Yüz köməkçi əl neyləsin?!

**KÖLGƏSİZ**
***(Qıfılbənd)***

Səndən xəbər alım, ay Aşıq Teymur,
Necə daşdır hər nişanı kölgəsiz?
O nədir ki, nə dincəlib, dayanmaz,
Nə dolanır bu dünyanı kölgəsiz.

O nədir ki, nəfəsi yox, qanı var,
O nədir ki, hər bir rəngdən donu var?
O nədir ki, nə yurdu, nə məkanı var,
Gəşt eyləyər hər bir yanı kölgəsiz.

Oruc deyər: "Nədir yerin pərgarı,
O nədir ki, gah qız olur, gah qarı.
O nədir ki, yerin, göyün ləngəri,
Əgər bilsən, hər nişanı kölgəsiz?!..."

**YAR SİNƏ-SİNƏ**
*(Təcnis)*

O hilal qaşını görəndə gözüm,
Müştaq oldum onun yar sinəsinə.
Laçın tərpənişli, tovuz cilvəli,
Qaldım qulluğunda, yar, sinə-sinə.

Gəzib bu dağları lalə üzəsən,
İnsaf eylə, gəl dərdimi üzəsən.
Busə nədir, qıymayırsan üzə sən,
Xəncərlə bağrımı yar sinə-sinə.

Oruc deyir: "Sən gələndə Yasəmən,
Gah şad olub, gah batıram yasa mən".
Nitqi, nəfəsindən qopur yasəmən,
O nədir köksündə yar sinə-sinə.

*Yada düşər xatirələr...*



**Mahmud KAMALOĞLU**
**professor**

# URFANİ MÖCÜZƏSİ

Bu əhvalat təxminən otuz il bundan əvvəl olmuşdu. Borçalıda qorabişirən ayının ən isti günlərindən biri idi. Səhər tezdən Dərviş Osman bizə uşaq göndərib məni təcili evlərinə çağırtdırdı. Onun bu cür tələm-tələsik çağırtdırdığından başa düşdüm ki, kimsə uzaqdan gələni var. Gələn kim idisə ya çox hörmətli, ya da çox vacib adam idi. Yoxsa belə istidə hələm-hələm çağırtdırmazdı şair məni.

Uşağı yola salıb, az sonra dalınca şairgilə yola düşdüm. Düzdü, o, bizdən çox da uzaqda yaşamasa da, bir yeddi-səkkiz döngəni ayaqla getmək lazım gəlirdi.

Səhər olmasına baxmayaraq gün artıq xeyli qalxmış, havanı da möhkəmcə isitmişdi, elə bil aradan heç gecə keçməmişdi, sanki dünənki günün istisi də bugünkünə qarışmışdı. Yolboyu gələn adamın kim olduğunu düşünsəm də, təxmin edə bilmədim. Azərbaycandan Borçalıya, Tiflisə yola düşən, əli qələm tutan, əli saz tutan, elm əhli və nə bilim daha kimlər yolüstü mütləq onun qonağı olur, bir stəkan çayını içirdilər. Bu fikirlərlə onların evlərinə yaxınlaşmağa başladım. Ətrafda cırcıramaların səsindən başqa heç nə eşidilmirdi, həyət-bacada ins-cins belə gözə dəymirdi...

Şairin həyətində, düz qapısının ağzında ağ rəngli bir "Jiquli" maşını dayanmışdı. Sürücü sanki istinin qorxusundan maşını qapıya elə yaxınlaşdırmışdı ki, maşından düşən kimi qapıya ancaq bir addım qalırdı.

Şair evi təzə tikdirdiyindən həyətdə hələ nə bir ağac basdırılmışdı, nə də ki, digər kol-kos belə yox idi. Böyük həyətin ora-burasında bitən otlar da susuzluqdan çoxdan qurumuş, sanki günəş onlardan da intiqam alırmış kimi, çoxdan axırlarına çıxmışdı.

Həmin il yay girəndən göydən bir damcı belə yağış düşməmişdi. Deyilənə görə uzun vaxt idi ki, belə quraqlıq, belə isti hava olmayıbmış.



Yolda durub şairi səslədim, səsimə hay verən olmadı. Günəşin istisindən içəri çəkilmiş ev sahibləri ərindiklərindən, yoxsa başları gələn qonaqlarla söhbətə bərk qarışdığından içəridəkilərdən səs gəlmədi. Bəlkə də ev yoldan uzaq olduğu üçün səsim onlara çatmamışdı. Bir də səsləndim, adam günəşin istisindən səsini hündürdən çıxarmağa da ərinirdi elə bil.

Nəhayət, adam görünməsə də, içəridən kimsə sələndi: “Buyur, içəri gəl”. Doğrudan da içəri girəndə hiss etdim ki, eşiyə baxanda bura cənnətdi. Şair:

- Buyur, tanış ol, ən əziz qardaşım Aydın. Daha doğrusu, aşıq Aydın Çobanoğlu, əslən Tovuzun Əlimərdanlı kəndindədir. Hal-hazırda Bakıda yaşayır, orda sazımızın sirlərini körpə balalarımıza öyrədir. Bu da xanımıdır.

Ortaboylu, qarabuğdayı qonağı görən kimi tanıdım, televizorda, öz yetirmələri olan körpə aşıqlarla çıxışlarına çox qulaq asmışdım.

- Səndən bir ricam var, - deyə, - şair əlavə etdi. Aydının kiçik qardaşının toyudur, gəliblər ki, Tiflisdən toy üçün lazım olan bəzi şeyləri alsınlar. O, şəhəri tanımır, həm də tanısa da, nəyin hardan alınmasında çətinliyi olacaq. Hava da görürsən necədir. Özün yaxşı bilirsən ki, mən onlarla şəhərə getdim nə, getmədim nə, yəni mənim onlara heç bir köməyim dəyən deyil. Qısası, bu işlərdə səriştəlisən, sən daha yaxşı bilirsən.

Məsələ aydın idi, qonaqlarla Tiflisə mən getməliydim. Yaxamı qırağa çəkmək heç düzgün deyildi. Öz-özümə düşündüm; havanın bu cür istisində indi şəhər od tutub yanır, asfalt adamı ayaqqabısından tutub saqqız kimi yerə yapışdırır. Könülsüz də olsam, bunu qonaqlara büruzə vermədən razılaşdım. Fikirləşdim ki, nə qədər tez gedib gəlsək, bir o qədər yaxşı olar.

Biz hazırlaşıb yola düşəndə şair bərk-bərk tapşırdı ki, olmaya-olmaya orada çörək yeyəsiz, siz gələnə kimi hər şey hazırlatdıracam. İnsafən

deyim ki, şair bunu dönə-dönə həm qonaqlara, həm də ayrıca mənə bərk tapşırdı.

Tiflisə çatanda hava hərarətini elə bil ikiqat artırmışdı. Kim bilir, bəlkə də bu cür isti yay yüz ildə bir dəfə olur.

Xülasə, Aydının axtardıqları nə vardısa, xoşbəxtlikdən hamısını rahatlıqla tapdıq. Bəlkə də özgə vaxt olsaydı, bu şeyləri belə tez tapa bilməzdik. Şəhərdə adam həddən artıq az olduğu üçün biz işlərimizi vaxtında qurtara bildik.

Saat təxminən üç-dörd radələrində kəndə qayıtdıq. Şair bizi evdə gözləyirdi. Evin qabağında, həyətin düz ortasında günəşin altında samovar poqquldayırdı.

- Buyurun, içəri keçin, - dedi və özü də hamıdan qabaqda içəri girdi. İsti məni əldən saldığı üçün birtəhər özümü tez evimizə çatdırmaq istəyirdim. Ona görə də elə Aydınla maşının yanındaca sağollaşıb getmək istəyirdim. Belə havada heç aclıq-zad da yada düşmürdü. Ancaq birtəhər özümü sərin yerə verib, uzanıb dincəlməkdən gözəl heç nə olmazdı.

Aydın maşının qapısını aralı qoyub, içəridə nəyisə eşələyirdi. Mən də günün altında durub onu gözləyirdim ki, vidalaşıb gedim. O, maşında nəyisə tapa bilmədiyi üçün ciblərini bir də eşələdi, təkrar bir də maşının içərisinə doğru əyildi. Səbrim lap tükənmişdi, isti nəfəsimi kəsmişdi, daha dözə bilmirdim. Amma düşünürdüm ki, çıxıb getmək ədəbsizlik olar. Bu qədər yaxşılıq et, axırda da beş dəqiqə gözləmə.

Nəhayət, aşıq maşının qapısını örtdü, mənim də ürəyim yerinə düşdü ki, artıq getmək üçün vaxtdır. Tez onunla görüşüb, ayrılmaq istədim, əlim havada qaldı. O, bu dəfə maşının yük yerinin yanında dayanıb mənə:

- Qardaş, borclu borclunun sağlığını istər deyib dədələrimiz, mən borclu olmaq istəmirəm, elə indi borcumu qaytarmaq istəyirəm, – deyib bağajı açdı, sazı futlyardan çıxartdı. Fikirləşdim ki, yəqin sazı içəri aparmaq istəyir. Ancaq futlyarı maşının baqajının üstünə qoydu və sazı əlinə götürdü.

Öz-özümə fikirləşdim ki, bu nəfəskəsici istidə, ac-susuz, yorğun halda o, nə etmək istəyir. Düzü, saz vurğunu, aşıq dəlisi olsam da, belə bir vaxtda heç nə umrumda deyildi. Təkcə günün altından birtəhər aralanıb, başımı bir kola soxmaq arzusundaydım.

Həyətin düz ortasında, günün o qızmarında Aydın sazı sinəsinə basdı. Məcbur olub könülsüz-könülsüz ona qulaq asmağa başladım. Axı o, sazı mənim üçün çalırdı, həyətdə məndən savayı adam da yox idi. Ürəyimdə gileyləndim, "ay insafsız, burax məni gedim, əl çək yaxamdan, heç nə istəmirəm, hətta sazı belə".

Onun isə vecinə deyildi, gözləri yumulu, nə mənim yazıq-yazıq günün altında durmağıma, nə günəşin onsuz da onun qaralmış sifətinə belə hərarətlə vurmağına heç əhəmiyyət vermirdi, sanki nə mən, nə də qorabişirən ayın bu dəhşətli istisi vecinə deyildi bu saz dəlisinin.

“Ruhani”nin ürəyi təlatümə gətirən səsini dinlədikcə elə bil mən də sərinlədim, susuzluğum da azaldı, aclığım da elə bil yavaş-yavaş getdi.

Aydının barmaqları saza elə dəyirdi ki, elə bil barmaqlar simlərdən aralansa, simlər qırılıb yerə töküləcək. O, elə çalır, elə çalırdı ki, sanki qarşıdakı Aydın deyil, Dədə Əmrah idi.

Aydın çalırdı, saz onun sinəsinin lap yuxarısında, çənəsinin düz altında dururdu. Aydın çalırdı, çaldıqca qara sazın qolu yavaş-yavaş düz yuxarı tuşlandı, sonra yavaş-yavaş saz aşığın başı üstünə qalxdı, onun əlləri zorla çatırdı simlərə. İlahi, sanki yuxarıdan ilahi bir qüvvə kəndirlə saz bərabər aşığı yuxarı dartırdı. Saz qarışıq Aydın uca bir sərv ağacına dönmüşdü. Mən özümdə deyildim. Öz-özümə fikirləşdim ki, yəqin isti məni vurub, özümdə deyiləm. Aydını aşağıdan-yuxarı bir də süzdüm, saz qarışıq o məndən iki dəfə uzun görünürdü. Xeyr, yanılmamışdım, özümü toplayıb yerə baxanda gördüm onun ayaqları yerdən üzülhaüzüldü, ayaqqabılarının burnunun ucu yerə dəyər-dəyməzdi. Onun isə indi heç nə vecinə deyildi, “Ruhani” onu kim bilir haralara aparmışdı. Amma düzünü deyim ki, bəlkə də “Ruhani”nin bu ecazkar möcüzəsi məni ondan da uzaqlara aparmışdı.

İlahi, nə qədər məharətlə çalırdı “Ruhani”ni Aydın! Xeyr, mən deyəsən günün istisindən qəhərlənmişdim. Məni yəqin qara basırdı, yoxsa belə bir möcüzə gözümün qabağında görünürdü.

Nəhayət, Aydın barmağını simə son dəfə toxundurdu, “Ruhani”ni başa çatdırdı və gözlərini açdı.

Bu vaxt hiss etdim ki, mənim də ayaqlarım tappıltı ilə yerə dəydi. Sən demə, onunla bərabər “Ruhani” məni də göyə qaldırıbmış.

***29.01.2009***

# BİR YAZININ ƏKS-SƏDASI

Hörmətli oxucular, əgər xatırlayırsınızsa, “Ozan dünyası”nın 2011-ci ildəki ikinci sayında filologiya elmləri doktoru, professor İsmayıl Məmmədlinin “Bir foto-şəkilin tarixi” adlı məqaləsi dərc olunmuşdu. Müəllif həmin məqalədə XX əsr Azərbaycan aşıq sənətinin görkəmli nümayəndəsi Dədə Şəmşirin yarım əsr bundan əvvəl - 1959-cu ildə Azərbaycan



Elmlər Akademiyasının Nizami adına Ədəbiyyat və Dil İnstitutunun, Ədəbiyyat Tarixi Muzeyinin əməkdaşlarından bir qrupu ilə çəkdirdiyi fotoşəkildən bəhs edir, həmin tarixi şəkildəki insanlar haqqında söhbət açır.

Şəkildəkililərin kimliyi barədə orada İsmayıl müəllim belə yazıb: “Oturanlar: Şəmşirin sağında Əminə Həbibzadə (vaxtilə lüğətçilik şöbəsində çalışmışdır, hazırda həyatda yoxdur), solunda filologiya elmləri doktoru, Azərbaycan dilinin tarixi şöbəsinin baş elmi işçisi Afina Əlizadə (hazırda 81 yaşındadır, elmi fəaliyyətini davam etdirir). Ayaq üstə duranlar (bunların hamısı dünyasını dəyişmişdir) sağdan sola: Zərrintac Tağıyeva (lüğətçilik şöbəsi), Zümrüd Rəfili (professor Mikayıl Rəfilinin bacısı, kitabxanaçı), Sara Hüseynova (akademik Heydər Hüseynovun qızı, fəlsəfə elmləri namizədi), filologiya elmləri namizədi Minayə Cavadova (dil tarixçisi), ədəbiyyatşünas Rəfiqə Qasımova, ayaqüstə duranlardan dördüncüsünün adını, soyadını müəyyənləşdirə bilmədik”.

Bu günlərdə redaksiyamıza zəng edən filologiya elmləri doktoru, N.Gəncəvi adına Ədəbiyyat Muzeyinin elmi işlər üzrə direktor müavini Xatirə Bəşirili isə bizə bildirdi ki, şəkildə ayaqüstə duiranların heç də

hamısı müəllifin dediyi kimi dünyasını dəyişməyib, onlardan məşhur akademik Heydər Hüseynovun qızı Sara Hüseynova sağdır və hazırda da Ədəbiyyat Muzeyində fəaliyyət göstərir. Biz bu yanlışılığa görə Sara xanımdan həm redaksiyamızın, həm də müəllifin adından üzr istəyir, ona uzun ömür və fəaliyyətində uğurlar arzulayırıq.

Xatirə xanımın daha bir dəqiqləşdirməsi isə İ.Məmmədlinin adını, soyadını öyrənə bilmədiyi bir nəfər – şəkildə ayaqüstə duranlardan soldan dördüncü şəxs barədə oldu. Onun dediyinə görə bu, vaxtilə Ədəbiyyat Muzeyində çalışmış Fəridə Axundovadır.

Hörmətli alimimiz Xatirə xanım Bəşirliyə diqqətinə görə təşəkkür edirik.

**"Ozan dünyası"**



# BİLDİRİŞ

2012-ci il aprelin 13-16-da İ.Cavaxişvili adına Tiflis Dövlət Universiteti Azərbaycan Milli Elmlər Akademiyasının Folklor İnstitutu, Türkiyənin Ardahan Universiteti, Türk Dünyası Mühəndislər və Memarlar Birliyi, Qafqaz Universitetlər Birliyi və Valeh Hacılar Beynəlxalq Elmi-Mədəni Tədqiqat Fondu, Suxumi Dövlət Universiteti ilə birgə **professor Valeh Hacıların xatirəsinə** həsr olunmuş **“Qafqaz xalqlarının folkloru və lingvokulturologiyası”** mövzusunda Beynəlxalq Elmi Simpoziumun keçirilməsini planlaşdırır.

**Simpoziumun mövzuları:** Türkologiya və Qafqazşünaslığın problematikası, Qafqaz xalqlarının folkloru, Qafqaz xalqlarının tarixi və mədənyyəti, lingvokulturologiya (areal linqvistika, tipologiya və komparavistika).

Simpoziumun iş dilləri: Gürcü, Azərbaycan, Türk, İngilis və Rus.

Simpoziumda iştirak etmək istəyənlər öz tezislərini bu iki dildə: gürcü-ingilis, Azərbaycan-ingilis, türk-ingilis, ingilis-rus, hər dildə 300-dən artıq söz olmamaq şərti ilə (**Word** formatında **Times New Roman** şriftində) 2012 il fevralın 20-dək **caucasiology@gmail.com**, **alishamil@yahoo.com**, **calyilmaz@mynet.com** və ya **haciyevf@yahoo.com** elektron ünvanlarına göndərə bilərlər.

Simpozium TİflisDövlət Universitetində keçiriləcək.

Qeydiyyat ödənişi - 25$.

P.S. Xahiş edirik anket-ərizə formasını doldurasınız (anket-ərizə forması əlavə edilir).

**Təşkilat komitəsi**

## Anket-ərizə forması

| | |
|---|---|
| Adı | |
| İkinci adı, təxəllüsü (əgər varsa) | |
| Soyadı | |
| Təmsil etdiyi təşkilat | |
| Vəzifəsi | |
| Tədqiqat sahəsi | |
| İş ünvanı | |
| E-mail | |
| Telefon | |
| Mobil Telefon | |
| Fax | |
| Poçt ünvanı | |

# MÜNDƏRİCAT

***AZƏRBAYCAN AŞIQLAR BİRLİYİ***

# "OZAN DÜNYASI"

***Nəşriyyatın direktoru: professor N.B.Məmmədli***

**Korrektor: Elşad ÇOBANLI**

*Yığılmağa verilmiş 10.12.2011*
*Çapa imzalanmış 24.12.2011*
*Şərti çap vərəqi 7. Sifariş № 382.*
*Kağız formatı **70x100** 1/16. Tiraj 1000*

*Jurnal **«Elm və təhsil»** nəşriyyat-poliqrafiya müəssisəsində hazır diapozitivlərdən çap olunmuşdur.*
Ünvan: Bakı, İçərişəhər, 3-cü Maqomayev döngəsi 8/4.
Qiyməti müqavilə ilə.